**Hər bir vətəndaş vergi ödəməkdən şərəf duymalıdır!**

# VERGİLƏR



Biz bazar iqtisadiyyatını vergi yolu ilə tənzimləməliyik
Heydər ƏLİYEV

№ 10 (454) | 11 mart 2009-cu il | *Qiyməti: 30 qəpik*

# Azərbaycan Prezidenti İlham Əliyev İrana rəsmi səfər etmişdir

Martın 10-da Azərbaycan Respublikasının Prezidenti İlham Əliyev İran İslam Respublikasına rəsmi səfərə yola düşmüşdür.

Azərbaycanın və İranın dövlət bayraqları ilə bəzədilmiş Tehranın "Mehrabad" hava limanında Azərbaycan Prezidentinin şərəfinə fəxri qarovul dəstəsi düzülmüşdü.

Prezident İlham Əliyevi İranın xarici işlər naziri Mənuçehr Mottəki və digər rəsmi şəxslər qarşıladılar.

Milli geyimli uşaqlar dövlətimizin başçısına gül dəstəsi təqdim etdilər.

Həmin gün Azərbaycan Prezidenti İlham Əliyevin rəsmi qarşılanma mərasimi olmuşdur.

Azərbaycanın və İranın dövlət bayraqlarının asıldığı Prezident sarayının qarşısındakı meydanda Azərbaycan Prezidentinin şərəfinə fəxri qarovul dəstəsi düzülmüşdü.

İran Prezidenti Mahmud Əhmədinejad Azərbaycan Prezidenti İlham Əliyevi qarşıladı.

Azərbaycanın və İranın dövlət himnləri səsləndi.

Fəxri qarovul dəstəsinin rəisi Azərbaycan Prezidentinə raport verdi.

Dövlət başçıları fəxri qarovul dəstəsinin önündən keçdilər. Azərbaycan Prezidenti İlham Əliyev İran əsgərlərini salamladı.

İranın rəsmi şəxsləri Azərbaycan Prezidentinə, Azərbaycan nümayəndə heyətinin üzvləri İran Prezidentinə təqdim olundular.



Rəsmi qarşılanma mərasimindən sonra Azərbaycan Prezidenti İlham Əliyev və İran Prezidenti Mahmud Əhmədinejadın təkbətək görüşü olmuşdur.

Görüşdə ölkələrimiz arasında ikitərəfli münasibətlərin müxtəlif sahələrdə, o cümlədən siyasi, iqtisadi və humanitar sahələrdə uğurla inkişaf etdiyi vurğulandı.

Azərbaycan Prezidentinin İrana rəsmi səfərinin əhəmiyyətinə toxunan dövlət başçıları bu səfərin qarşılıqlı əlaqələrin daha da genişlənməsinə xidmət etdiyini bildirdilər.

Görüşdə Azərbaycan-İran münasibətlərinin bundan sonra da möhkəmlənəcəyinə əminlik ifadə olundu.

Təkbətək görüşdən sonra Azərbaycan Respublikasının Prezidenti İlham Əliyevin və İran İslam Respublikasının Prezidenti Mahmud Əhmədinejadın nümayəndə heyətlərinin iştirakı ilə geniş tərkibdə görüşü olmuşdur.

Görüşdə ölkələrimiz arasında ikitərəfli əlaqələrin inkişaf səviyyəsindən məmnunluq ifadə edildi, siyasi, iqtisadi və humanitar sahələrdə əməkdaşlığın yaxşı perspektivləri olduğu bildirildi.

Görüşdə ikitərəfli münasibətlərin perspektivlərinə dair fikir mübadiləsi aparıldı, qarşılıqlı əlaqələrin bundan sonra da genişlənəcəyinə əminlik ifadə olundu.

Geniş tərkibdə görüş başa çatdıqdan sonra Azərbaycan Prezidenti İlham Əliyevin və İran Prezidenti Mahmud Əhmədinejadın iştirakı ilə sənədlərin imzalanma mərasimi olmuşdur.

# Azərbaycan Prezidenti İlham Əliyev Türkiyə Respublikasının Jandarm Qüvvələri komandanı, ordu generalı Atilla İşıkı qəbul etmişdir



Atilla İşık bu vəzifəyə təyin olunandan sonra xarici ölkələr sırasında ilk dəfə Azərbaycana səfər etməsindən məmnunluq duyduğunu dedi. O, ümummilli lider Heydər Əliyevin qeyd etdiyi kimi, bir millət, iki dövlət olan Azərbaycan və Türkiyə arasında dostluq və qardaşlıq münasibətlərinin daim inkişaf etdiyini vurğuladı, Türkiyə Jandarm Qüvvələri ilə Azərbaycanın müvafiq qurumları arasında əməkdaşlığın genişləndiyini dedi. Atilla İşık bu əməkdaşlığın ölkələrimiz arasında əlaqələrin möhkəmlənməsinə xidmət etdiyini bildirdi.

Dövlətimizin başçısı Atilla İşıkın Türkiyə Jandarm Qüvvələri komandanı kimi ilk səfərini Azərbaycana etməsinin əhəmiyyətli olduğunu dedi, ölkələrimiz arasında dostluq münasibətlərinin müxtəlif sahələrdə uğurla inkişaf etdiyini qeyd etdi. Prezident İlham Əliyev əmin olduğunu bildirdi ki, Atilla İşıkın Azərbaycana səfəri çərçivəsində keçirdiyi görüşlər Türkiyə Jandarm Qüvvələri ilə Azərbaycanın əlaqədar qurumları arasında əməkdaşlığın genişləndirilməsi işinə xidmət edəcək.

## Azərbaycan Respublikası Prezidentinin Sərəncamı

**N.Ə.Əmirovun Azərbaycan Respublikasının vergilər nazirinin birinci müavini təyin edilməsi haqqında**

Natiq Ərziman oğlu Əmirov Azərbaycan Respublikasının vergilər nazirinin birinci müavini təyin edilsin.

**İlham ƏLİYEV**
**Azərbaycan Respublikasının Prezidenti**

***Bakı şəhəri, 4 mart 2009-cu il***

## Azərbaycan Respublikası Prezidentinin Sərəncamı

**S.P.Məmmədxanovun Azərbaycan Respublikasının vergilər nazirinin müavini təyin edilməsi haqqında**

Sahir Polad oğlu Məmmədxanov Azərbaycan Respublikasının vergilər nazirinin müavini təyin edilsin.

**İlham ƏLİYEV**
**Azərbaycan Respublikasının Prezidenti**

***Bakı şəhəri, 4 mart 2009-cu il***

# Azərbaycan-Almaniya əlaqələri genişlənir

Prezident İlham Əliyev ilə görüşdə nümayəndə heyətinin rəhbəri Yurgen Qrossman Azərbaycanda nümayəndəliyini yaradan "RWİ" energetika şirkətinin fəaliyyəti barədə dövlətimizin başçısına məlumat verdi və ölkəmizdə xarici şirkətlərin sərbəst və azad fəaliyyəti üçün hər cür şəraitin yaradıldığını bildirdi. Neft-qaz sektorunda Azərbaycanla gələcəkdə əməkdaşlıq etmək marağında olduqlarını deyən qonaq, ölkəmizlə etibarlı tərəfdaş kimi fəaliyyət göstərmək əzmində olduqlarını vurğuladı.

Dövlətimizin başçısı "RWİ" energetika şirkətinin nümayəndə heyətinin Azərbaycanda görüşlərinin və apardığı danışıqların səmərəli keçəcəyinə ümidvar olduğunu bildirdi.

Görüşdə "RWİ" energetika şirkəti ilə Azərbaycanın aidiyyatı qurumları arasında əməkdaşlığın perspektivlərinə dair məsələlər barədə fikir mübadiləsi aparıldı.

11 mart 2009-cu il № 10 (454)

# Vergilər Nazirliyi qadın əməkdaşlarını bayram münasibətilə təbrik edib






8 Mart - Beynəlxalq Qadınlar Günü münasibətilə mart ayının 6-da Vergilər Nazirliyinin Mərkəzi Aparatında tədbir keçirilib. Bayram tədbirində vergilər nazirinin 1-ci müavini, 3-cü dərəcəli dövlət vergi xidməti müşaviri Natiq Əmirov, Vergilər Nazirliyinin Aparatının rəhbəri, baş vergi xidməti müşaviri Asif Cahangirov, Kadr siyasəti və hazırlığı idarəsinin rəisi, baş vergi xidməti müşaviri Faiq Şahbazov, Maliyyə-təsərrüfat idarəsinin rəisi, baş vergi xidməti müşaviri Qüdrət Seyfullayev və nazirliyin qadın kollektivi iştirak ediblər.

Tədbiri giriş sözü ilə Natiq Əmirov açıb. O, Vergilər Nazirliyinin bütün qadın əməkdaşlarını 8 Mart - Beynəlxalq Qadınlar Günü münasibətilə vergilər naziri və nazirliyin rəhbərliyi adından təbrik edərək, onlara möhtərəm Prezidentimiz cənab İlham Əliyev tərəfindən vergi orqanı qarşısında qoyulan mühüm vəzifələrin yerinə yetirilməsində, ölkənin daha da qüdrətlənməsi naminə görülən şərəfli və məsuliyyətli işlərində müvəffəqiyyətlər, ailə səadəti, xoşbəxtlik arzulayıb.

Sonra söz Kadr siyasəti və hazırlığı idarəsinin rəisi Faiq Şahbazova verilib. O da öz növbəsində qadınları bayram münasibətilə təbrik edərək, onların ünvanına xoş sözlər bildirib. Son dövrlərdə respublikanın ictimai-siyasi həyatında qadınların rolunun artdığını qeyd edən idarə rəisi bu tendensiyanın vergi orqanlarında da özünü göstərdiyini vurğulayıb.

Vergilər Nazirliyinin Aparatının rəhbəri Asif Cahangirov çıxış edərək, qadınları əziz bayram münasibətilə səmimi qəlbdən təbrik edib. A.Cahangirov möhtərəm Prezidentimiz cənab İlham Əliyevin vergi xidməti əməkdaşlarına göstərdiyi diqqət və qayğıdan, eləcə də dövlətimizin daha da qüdrətlənməsi naminə vergi orqanları qarşısında qoyulmuş şərəfli və məsuliyyətli vəzifələrdən bəhs edib. Aparat rəhbəri bu işdə nazirliyin qadın əməkdaşlarının böyük rol oynadığını bildirib, onlara şərəfli işlərində uğurlar diləyib.

Maliyyə-təsərrüfat idarəsinin rəisi Qüdrət Seyfullayev də qadınları təbrik edərək, vergilər naziri Fazil Məmmədovun əmri ilə nazirliyin qadın əməkdaşlarının bir vəzifə maaşı həcmində mükafatlandırıldığını bildirib.

Vergilər Nazirliyinin qadın əməkdaşları adından çıxış edən Kommersiya hüquqi şəxslərin dövlət qeydiyyatının təşkili və iqtisadi təhlil Baş İdarəsinin Vergi daxilolmalarının uçotu və təhlili şöbəsinin rəisi, baş vergi xidməti müşaviri Validə Muradova və mühasibatlığın aparıcı iqtisadçısı Sona Hüseynova dövlət başçısı cənab İlham Əliyevin diqqət və qayğısının hər bir vergi əməkdaşının gündəlik həyatında hiss olunduğunu, bu baxımdan tapşırılan bütün işlərə daha həvəslə və məsuliyyətlə yanaşıldığını bildiriblər.

Tədbirin sonunda bütün qadın əməkdaşlara bayram münasibətilə gül və hədiyyələr təqdim olunub.

**RÜFƏT**

# Vergilər Nazirliyində görüş keçirilmişdir





Ötən həftə Vergilər Nazirliyinin Mərkəzi Aparatında Beynəlxalq Maliyyə Korporasiyasının və İrlandiyanın "Enerprise Registry Solutions" şirkətinin nümayəndə heyəti ilə görüş keçirilmişdir.

Keçirilən görüşdə əsas məqsəd "Enerprise Registry Solutions" şirkəti tərəfindən Azərbaycanda kommersiya hüquqi şəxslərin dövlət qeydiyyatında "bir pəncərə" sisteminin qiymətləndirilməsi və qeydiyyat sisteminin gələcək inkişafı ilə bağlı görüləcək tədbirlərin müzakirəsi olmuşdur.

Görüşdə Vergilər Nazirliyi tərəfdən vergilər nazirinin müavini, 3-cü dərəcəli dövlət vergi xidməti müşaviri Sahir Məmmədxanov, vergilər nazirinin müşaviri, baş vergi xidməti müşaviri Asəf Əsədov, Kommersiya hüquqi şəxslərin dövlət qeydiyyatının təşkili və iqtisadi təhlil Baş İdarəsinin rəisi, baş vergi xidməti müşaviri Zaur Fətizadə, Beynəlxalq münasibətlər idarəsinin rəisi, baş vergi xidməti müşaviri İlqar Əkbərli və vergilər nazirinin mətbuat katibi, 1-ci dərəcəli müfəttiş Fariz Səmədov, qarşı tərəfdən isə Beynəlxalq Maliyyə Korporasiyasının (İFC) Azərbaycanda biznes mühitinin təkmilləşdirilməsi layihəsinin rəhbəri Boris Divyak, həmin layihənin hüquq məsələləri üzrə müşaviri Fəxriyar Cabbarov, "Enerprise Registry Solutions" şirkətinin baş meneceri Deklan Giney, həmin şirkətin layihə meneceri Stefan Mörrey və hüquq məsələləri üzrə ekspert Ronan Kormakeyn iştirak etmişlər.

Qonaqları salamlayan vergilər nazirinin müavini Sahir Məmmədxanov onları Bakıda görməkdən məmnun olduğunu qeyd etmişdir. Azərbaycanın vergi sistemində son illər həyata keçirilən uğurlu islahatlar haqqında məlumat verən Sahir Məmmədxanov əldə olunan nailiyyətlərdə ümummilli lider Heydər Əliyevin və onun layiqli davamçısı, möhtərəm Prezidentimiz cənab İlham Əliyevin müstəsna rolunun olduğunu bildirmişdir. Ölkə rəhbəri tərəfindən ötən ilin yanvar ayının 1-dən etibarən kommersiya hüquqi şəxslərin dövlət qeydiyyatının aparılmasının məhz Vergilər Nazirliyinə tapşırılmasının bütün nazirlik əməkdaşlarının üzərinə böyük məsuliyyət qoyulduğunu vurğulamışdır. Qeyd olunmuşdur ki, qısa müddət ərzində görülmüş işlər nəticəsində qeydiyyat proseduru tamamilə sadələşdirilmiş və sahibkarlar tərəfindən böyük razılıqla qarşılanmışdır.

Çıxış edən "Enerprise Registry Solutions" şirkətinin baş meneceri Deklan Giney Azərbaycanın paytaxtı Bakıda olmaqdan məmnunluğunu ifadə etmiş və "bir pəncərə" prinsipinin fəaliyyəti ilə tanış olmaq üçün yaradılan şəraitə görə nazirliyin rəhbərliyinə öz təşəkkürünü bildirmişdir. Bakıda olduqları müddət ərzində kommersiya hüquqi şəxslərin dövlət qeydiyyatının "bir pəncərə" prinsipi üzrə aparılması proseduru ilə yaxından tanış olduqlarını və bu müddət ərzində görülən işlərin təqdirəlayiqliyini vurğulamışdır. Deklan Giney görülən işlərin nəticəsi olaraq Dünya Bankı və Maliyyə Korporasiyasının layihəsi olan "Doing Business"in 2008-ci il üçün tərtib edilən hesabatında Azərbaycanın 64-cü pillədən 13-cü yerə yüksəldiyini və ən islahatçı ölkə elan olunduğunu qeyd etmişdir. Qonaq, eyni zamanda, biznes nümayəndələri ilə görüşdüklərini və həmin görüşlər zamanı "bir pəncərə" prinsipinin tətbiqinin müsbət qarşılandığının şahidi olduğunu bildirmişdir.

Sonra qeydiyyat sisteminin gələcək inkişafı, nəzərdə tutulan təkmilləşmələr və bu istiqamətdə görüləcək işlər haqqında ətraflı müzakirələr aparılmışdır.

**Toğrul ƏLİYEV**

11 mart 2009-cu il № 10 (454)

# İllik bəyannamələrin vaxtında təqdim olunması müddəti 31 martda başa çatır

***Azərbaycan Respublikasının Vergi Məcəlləsinin müvafiq müddəalarına əsasən hüquqi şəxslər mənfəət, əmlak və yol vergisi bəyannaməsini, fiziki şəxslər isə gəlir vergisi bəyannaməsini hesabat ilindən sonrakı ilin mart ayının 31-dən gec olmayaraq vergi orqanlarına təqdim etməlidirlər. Vergi ödəyiciləri tərəfindən digər vergi bəyannamələri ilə yanaşı, mənfəət və gəlir vergisinin bəyannamələrinin də vergi orqanlarına vaxtında təqdim edilməsi sahəsində könüllü əməletmə səviyyəsinin yüksəldilməsi istiqamətində tədbirlər həyata keçirilir. Bu tədbirlər sırasında vergi öhdəliklərinin yerinə yetirilməsi məqsədi ilə vergi ödəyicilərinin məlumatlandırılması və maarifləndirilməsi işlərinin aparılması məsələsi Bakı Şəhər Vergilər Departamentinin (BŞVD) daim diqqət mərkəzində olmuşdur.***




BŞVD-nin Vergi ödəyicilərinə xidmət şöbəsinin rəisi, 1-ci dərəcəli müfəttiş Rəşad Babayevin sözlərinə görə, 2009-cu ilin yanvar-fevral ayları ərzində departamentin vergi ödəyicilərinə xidmət strukturları tərəfindən 727 vergi ödəyicisinin iştirakı ilə keçirilmiş 25 görüş, brifinq və seminar-məşğələlərdə 2008-ci ilin yekunları ilə əlaqədar vergi bəyannamələrinin vaxtında (könüllü) təqdim edilməsi müddətləri, vergi öhdəlikləri və digər hüquq və vəzifələr barədə vergi ödəyiciləri ətraflı məlumatlandırılmışlar. Cari ilin yanvar-fevral ayları ərzində xidmət strukturları tərəfindən qəbul edilmiş vergi ödəyicilərinə 7118 halda bəyannamələrin vaxtında təqdim edilməsi, 1650 halda bəyannamələrin tərtib edilməsi, 4582 halda vergilərin vaxtında ödənilməsi barədə geniş izahatlar verilmişdir.

Bununla yanaşı, Azərbaycan Respublikası vergilər nazirinin 9 fevral 2009-cu il tarixli müvafiq əmri ilə təsdiq edilmiş yeni mənfəət və gəlir vergisinin bəyannaməsi və onların tərtib edilməsi qaydaları barədə də cari ilin fevral ayında keçirilmiş tədbirlərdə və qəbul edilmiş vergi ödəyiciləri ilə söhbətlərdə onlara ətraflı məlumatlar verilmişdir. Hazırda bu istiqamətdə müvafiq məlumatlandırma və maarifləndirmə işləri davam etdirilir.

R.Babayev bizimlə söhbətində bildirdi ki, vergi bəyannamələrinin vaxtında (könüllü) təqdim edilməsi səviyyəsinin artırılması məqsədilə müvafiq "Axtarış və Hesabat" informasiya sisteminə əsasən 2008-ci ilin yekununa görə mənfəət və gəlir vergisinin bəyannaməsini təqdim etməli olan vergi ödəyicilərinin siyahısı departamentin Vergi ödəyicilərinə xidmət şöbəsi tərəfindən təhlil edilmiş və həmin vergi ödəyicilərinin məlumatlandırılması istiqamətində görüləcək işlər müəyyən edilmişdir. Aparılmış təhlillər nəticəsində 2008-ci ilin yekununa görə mənfəət və gəlir vergisinin bəyannaməsini təqdim etməli olan vergi ödəyiciləri vergi öhdəliklərinin yerinə yetirilməsi səviyyəsinə və vergi qanunvericiliyi barədə məlumatlı olma vəziyyətinə görə ötən il ərzində fəaliyyətini dayandırmış, vergi orqanında qeydiyyata alınmış, ƏDV qeydiyyatına alınmış, 2007-ci ilin yekunu üzrə mənfəət və gəlir vergisi bəyannaməsini gecikmə ilə təqdim etmiş vergi ödəyiciləri qruplaşdırılmış və ünvanlı şəkildə məlumatlandırma tədbirlərinin həyata keçirilməsi üçün filialların vergi ödəyicilərinə xidmət şöbələrinə göndərilmişdir.

Filialların vergi ödəyicilərinə xidmət strukturları tərəfindən 2008-ci ilin yekununa görə mənfəət və gəlir vergisi bəyannaməsini təqdim etməli olan vergi ödəyicilərinə 9700-dən artıq bildiriş göndərilmişdir. Bu bildirişlərdə vergi ödəyicisi fəaliyyətdə olduqda müvafiq bəyannamənin, fəaliyyəti olmadıqda isə bu barədə arayışın təqdim edilmə müddətləri göstərilib. Həmçinin, bildirişlərdə vergilərin ödənilmə müddətləri, göstərilənlərə əməl edilmədikdə tətbiq olunacaq maliyyə sanksiyaları haqda məlumatlar əks olunmuşdur.

Onu da qeyd edək ki, Vergi Məcəlləsinin 74.1-ci maddəsinə əsasən hesabatın verilmə müddəti başa çatanadək vergi ödəyicisi gəlir vergisinin və ya mənfəət vergisinin hesabatının verilməsi müddətinin uzadılması barədə müraciət edərsə və bu zaman ödənilməli olan verginin məbləği tamamilə ödənilərsə, hesabatın verilmə müddəti üç ayadək uzadılır. Vergi ödəyiciləri ilə keçirilmiş görüş, brifinq və seminar-məşğələlərdə bu barədə ətraflı məlumat verilmişdir.

Vergi Məcəlləsinin 72.2-ci maddəsinə uyğun olaraq, vergi hesabatları vergi ödəyiciləri tərəfindən şəxsən və ya hesabatın təqdim edilməsi təsdiq oluna bilən hər hansı digər üsulla (rabitə təşkilatına təhvil verilməsi və ya müvafiq qanunvericiliyə uyğun olaraq elektron sənəd formasında göndərilməsi də daxil olmaqla) təqdim edilə bilər.

BŞVD-nin Vergi ödəyicilərinə xidmət şöbəsinin rəisinin sözlərinə görə, bəyannamələrin vaxtında təqdim edilməsi ilə yanaşı, hesabatların elektron formada təqdim edilməsi də daim departamentin diqqət mərkəzində olmuşdur. 2008-ci ilin yekununa görə mənfəət vergisinin bəyannaməsini təqdim etməli olan vergi ödəyicilərinin 88 faizi və gəlir vergisinin bəyannaməsini təqdim etməli olan vergi ödəyicilərinin 67 faizə yaxını ilə hesabatların elektron formada təqdim edilməsi barədə müqavilə bağlanmışdır.

Vergi ödəyicilərinə hesabatların elektron formada təqdim edilməsi üçün istifadəçi kodu, şifrə və parol olan qapalı zərf təqdim edilərkən, habelə keçirilən brifinq, seminar-məşğələdə və digər tədbirlərdə onlara "e-bəyannamə" xidmətinin üstünlükləri, mövcud xidmət növləri barədə məlumatlar verilir, bəyannamələrin tətbiqi proqramından istifadə, elektron formada bəyannamələrin göndərilməsi qaydaları izah olunaraq, hesabatların elektron formada təqdim edilməsi tövsiyə olunur. Bu istiqamətdə vergi orqanları tərəfindən izahat işlərinin aparılması davamlı xarakter daşıyır.

Əlavə olaraq qeyd etmək lazımdır ki, 1 dekabr 2008-ci il tarixdən etibarən vergi ödəyiciləri tərəfindən kağız formatda bəyannamə və hesabatlar ştrixkodla təqdim edildiyi halda da onların vergi orqanı tərəfindən qəbuluna başlanılmışdır. Bununla əlaqədar olaraq vergi ödəyiciləri ilə müvafiq məlumatlandırma işlərinin aparılması davam etdirilir.

Şöbə rəisi bildirdi ki, Vergi Məcəlləsində hesabatın vaxtında təqdim edilməməsinə, vergilərin vaxtında ödənilməməsinə və yayındırılmasına görə maliyyə sanksiyasının tətbiq edilməsi nəzərdə tutulmuşdur. Belə ki, vergi qanunvericiliyinə əsasən vergi hesabatının və ya fəaliyyətin olmaması barədə arayışı əsas olmadan müəyyən edilən müddətdə təqdim etməyən vergi ödəyicisi vergi orqanının qərarına əsasən 40 manat məbləğində cərimələnir. Bundan başqa, verginin hesabatda göstərilən məbləği verginin hesabatda göstərilməli olan məbləğinə nisbətən azaldılmışdırsa, habelə büdcəyə çatası vergi məbləği hesabat təqdim etməməklə yayındırılmışdırsa, vergi ödəyicisinə azaldılmış və ya yayındırılmış vergi məbləğinin 50 faizi miqdarında maliyyə sanksiyası tətbiq edilir. Həmçinin, vergi və ya cari vergi ödəməsi Vergi Məcəlləsi ilə müəyyən edilmiş müddətdə ödənilmədikdə, ödəmə müddətindən sonrakı hər bir ötmüş gün üçün vergi ödəyicisindən ödənilməmiş vergi və ya cari vergi ödəməsi məbləğinin 0,1 faizi məbləğində faiz tutulur.

Beləliklə, vergi ödəyicilərinə 2008-ci ilin yekununa görə mənfəət, əmlak, yol və gəlir vergisi hesabatlarını (bəyannamə və ya fəaliyyətin olmaması barədə arayışı) cari ilin mart ayının 31-dən gec olmayaraq vergi orqanlarına təqdim etmək və hesablanmış vergiləri müəyyən edilmiş müddətdə dövlət büdcəsinə ödəməklə qanunvericiliyin tələblərinə əməl etmələri tövsiyə olunur. Əks təqdirdə, vergi ödəyicilərinin cərimə və maliyyə sanksiyaları ilə cəzalandırılacaqları istisna edilmir.

**R.SADIQOV**

# Operativ vergi nəzarəti tədbirləri davam etdirilir

Vergilər Nazirliyi əhali ilə nağd pul hesablaşmalarının aparılması qaydalarına riayət olunmasına, bu zaman nəzarət-kassa aparatlarından istifadə edilməsi, həmçinin vergi orqanlarında uçota durmadan fəaliyyət göstərən ödəyicilərin aşkar edilməsi, valyuta sərvətlərinin ödəniş vasitəsi olaraq qəbul edilməsi və s. kimi operativ nəzarətin əhatə funksiyalarına daxil olan məsələlər üzrə nəzarət tədbirlərini davam etdirir.

1 fevral 2009-cu il tarixdən 1 mart 2009-cu il tarixədək keçirilmiş operativ nəzarət tədbirləri zaman 1145 vergi ödəyicisində qanunvericiliyin pozulması faktları aşkar edilmiş və müvafiq tədbirlər görülmüşdür. Bu zaman 493 vergi ödəyicisində nağd hesablaşmaların aparılması qaydalarının pozulması, 117 vergi ödəyicisində valyuta sərvətlərinin ödəniş vasitəsi kimi qəbul edilməsi faktları aşkar olunmuşdur. Keçirilən tədbirlər zamanı vergi orqanlarında uçota durmadan fəaliyyət göstərən 109 vergi ödəyicisi aşkar edilmiş, 258 vergi ödəyicisinin xüsusi razılıq (lisenziya) tələb olunan fəaliyyət növləri ilə belə razılıq (lisenziya) olmadan məşğul olması faktları müəyyən edilmişdir.

Vergi orqanlarının həyata keçirdiyi operativ nəzarət tədbirləri zamanı 47 vergi ödəyicisində 50 nəfər fiziki şəxsin əmək müqaviləsi bağlamadan işə cəlb edilməsi, 51 vergi ödəyicisinin fərqlənmə nişanı olmadan avtomobil nəqliyyatı ilə sərnişin daşıması, 45 şəxs tərəfindən valyuta sərvətlərinin ictimai yerlərdə alınıb-satılması faktları aşkar olunmuşdur.

Aksiz markalarının tətbiqi vəziyyətinə nəzarət məqsədilə keçirilən tədbirlər zamanı isə 25 vergi ödəyicisində 530.30 manat dəyərində 463 ədəd aksiz markaları ilə müvafiq qaydada markalanmamış mallar aşkar edilmişdir.

**Vergilər Nazirliyinin Aparatının İctimaiyyətlə əlaqələr şöbəsi**

11 mart 2009-cu il № 10 (454)

# 2008-ci il Vergilər Nazirliyi üçün uğurlu olub

## *Azərbaycan Respublikasının Vergilər Nazirliyi tərəfindən 2008-ci ildə görülmüş işlər haqqında HESABAT*

**(əvvəli ötən saylarımızda)**

### Daxili nəzarətin təşkili sahəsində

Daxili nəzarətin təşkili sahəsində 2008-ci ildə nazirliyin ümumi strateji kursuna uyğun olaraq aşağıdakı tədbirlər həyata keçirilmişdir:

2008-ci ildə "Vergi orqanlarının vəzifəli şəxslərinin xüsusi geyim formasından istifadə Qaydaları", "Azərbaycan Respublikası vergi xidməti əməkdaşlarının xidmət keçmə Qaydaları" və "Vergilər Nazirliyinin vəzifəli şəxslərinin sıra baxışı Qaydaları", eləcə də yeni redaksiyada "Dövlət vergi orqanlarında normativ-hüquqi aktların və təşkilati-sərəncam sənədlərinin icra vəziyyətinin monitorinqi Qaydaları" hazırlanaq müvafiq əmrlərlə təsdiq edilmişdir.

2008-ci ildə daxili nəzarət strukturlarına vətəndaşlardan (o cümlədən vergi ödəyicilərindən) vergi orqanlarının əməkdaşlarının qanunsuz hərəkətləri barədə birbaşa və mərkəzi dövlət hakimiyyəti orqanlarından daxil olmuş 107 müraciətinə müvafiq qaydada baxılmışdır.

Xidməti yoxlamalar nəticəsində nöqsanlara yol vermiş 44 əməkdaş barədə qanunamüvafiq tədbirlər görülmüşdür. O cümlədən 4 nəfər vəzifəli şəxs barələrində müvafiq qərar qəbul edilənədək tutduqları vəzifədən kənarlaşdırılmış, 5 nəfər isə aşağı vəzifəyə keçirilmiş, 2 nəfər əməkdaşın xüsusi rütbəsi bir pillə aşağı salınmış, 33 nəfər barəsində intizam tənbehi tədbiri görülmüşdür.

2008-ci ildə 7 yoxlama-nəzarət tədbiri həyata keçirilmiş və təqsirkar hesab edilmiş 54 nəfər vəzifəli şəxs barəsində intizam tənbehi tədbirləri görülmüşdür.

Vergi ödəyicilərinin və vətəndaşların birbaşa daxili nəzarət strukturlarına müraciət imkanlarının genişləndirilməsi məqsədilə vergi qanunvericiliyinin tətbiqi, habelə vergi əməkdaşlarının hərəkətləri (hərəkətsizliyi) nəticəsində şəxslərin (vergi ödəyicilərinin və vətəndaşların) qanunla müəyyən edilmiş hüquq və mənafelərinin pozulması halları ilə bağlı yaranmış müraciətlərin (korrupsiya halları istisna olmaqla) daxili nəzarət strukturuna operativ çatdırılması, onların effektiv və qısa müddət ərzində araşdırılması məqsədilə Daxili audit baş idarəsinə birbaşa müraciət etmək üçün Vergilər Nazirliyinin rəsmi internet saytının xüsusi ayrılmış bölməsində link (***www.taxes.gov.azaudit***) yerləşdirilmişdir.

Eyni zamanda, Avropa Şurasının Korrupsiyaya Qarşı Dövlətlər Qrupunun (GRECO) korrupsiyaya qarşı mübarizə ilə bağlı aidiyyəti tövsiyələrinin Vergilər Nazirliyi tərəfindən icrası təmin olunmuş və görülmüş işlər barədə hesabatlar Korrupsiyaya qarşı Mübarizə üzrə Komissiyaya göndərilmişdir.

### Beynəlxalq münasibətlər sahəsində

2008-ci ildə "Gəlirlərə və əmlaka görə vergilərə münasibətdə ikiqat vergitutmanın aradan qaldırılması haqqında" beynəlxalq müqavilələrin bağlanması sahəsində işlər davam etdirilmişdir. Bu dövr ərzində Xorvatiya, İrlandiya, Yunanıstan və Sinqapur nümayəndə heyətləri ilə danışıqlar aparılmış, Niderland, İordaniya, Macarıstan və Koreya ilə ikiqat vergitutmanın aradan qaldırılması haqqında sazişlər imzalanmışdır.

Estoniya, Bolqarıstan, Qətər, Tacikistan və Koreya ilə sazişlər isə qüvvəyə minmişdir.

2008-ci ildə Moldova və Özbəkistanla vergi sahəsində əməkdaşlıq və informasiya mübadiləsi haqqında hökumətlərarası sazişlər imzalanmışdır.

Avropa İttifaqına (Aİ) daxilolma prosedurları ilə bağlı üzv olan ölkələrin təcrübəsinin öyrənilməsi məqsədilə Çexiya Mərkəzi Maliyyə və Vergi Direktorluğuna, Estoniya Vergi və Gömrük Şurasına Vergilər Nazirliyinin nümayəndə heyətlərinin səfərləri təşkil edilmiş, eyni zamanda, Avstriya Vergi idarəsinin nümayəndə heyəti Vergilər Nazirliyinə səfər etmişdir.

Vergi orqanlarında korrupsiya və digər qeyri-qanuni halların aşkarlanması və qarşısının alınması sahəsində təcrübə mübadiləsinin həyata keçirilməsi məqsədilə nümayəndə heyətləri Polşa Maliyyə Nazirliyinin Vergi Administrasiyasında və Ukrayna Dövlət Vergi Administrasiyasında səfərdə olmuşlar.

2008-ci ilin 21-22 sentyabr tarixlərində Niderland Krallığının Maliyyə üzrə Dövlət Katibi Yan de Yagerin başçılığı ilə nümayəndə heyəti Vergilər Nazirliyində səfərdə olmuş və səfər zamanı ikiqat vergitutmanın aradan qaldırılması haqqında Saziş imzalanmışdır.

Nümayəndə heyəti Azərbaycanın vergi sistemi ilə, Vergilər Nazirliyinin strukturu, aparılan islahatlar və görülən işlərlə, Avtomatlaşdırılmış Vergi İnformasiyası Sistemi (AVİS), kommersiya hüquqi şəxslərin dövlət qeydiyyatı zamanı tətbiq edilən "bir pəncərə" sistemi, işçilərin fəaliyyətinin qiymətləndirilməsi sistemi və cari ildən tətbiq edilən ƏDV depozit hesablarının fəaliyyəti sistemi ilə yaxından tanış edilmişdir.

Avropadaxili Vergi Administrasiyaları Təşkilatı (IOTA) ilə bağlı işlər davam etdirilmişdir. Nazirliyin nümayəndə heyəti təşkilatın 12-ci Baş Assambleyasında iştirak etmiş, "bir pəncərə" prinsipinin tətbiqi məsələsi ilə bağlı geniş təqdimat keçirmişdir. Keçirilmiş təqdimat assambleya iştirakçılarında xüsusi maraq doğurmuş və bununla bağlı onların suallarına cavablar verilmişdir.

Nazirliyin nümayəndə heyəti həmçinin Müstəqil Dövlətlər Birliyinin vergi (maliyyə) təhqiqatı orqanları rəhbərlərinin Koordinasiya Şurasının 18-19 iyun 2008-ci il tarixlərində Rusiya Federasiyasının Samara vilayətində keçirilmiş X iclasında iştirak etmişdir.

21 noyabr 2008-ci il tarixdə Bakı şəhərində Müstəqil Dövlətlər Birliyi iştirakçısı olan dövlətlərin vergi orqanları rəhbərlərinin Koordinasiya Şurasının XV iclası keçirilmişdir. İclas iştirakçıları Azərbaycanda əlavə dəyər vergisinin inzibatçılığı, xüsusilə də cari ildən tətbiq edilən ƏDV depozit hesablarının fəaliyyəti sistemi ilə yaxından tanış edilmiş, Xüsusi Rejimli Vergi Xidməti Departamentinin fəaliyyəti və kommersiya hüquqi şəxslərin "bir pəncərə" prinsipi üzrə dövlət qeydiyyatı prosesi ilə bağlı onlara ətraflı məlumat verilmişdir.

Bütün bunlar iclas iştirakçıları tərəfindən böyük maraqla qarşılanmış, son illərdə aparılmış uğurlu islahatlar yüksək qiymətləndirilmiş və Azərbaycanın digər ölkələr üçün artıq bir nümunə olduğu bildirilmişdir.

Azərbaycan Respublikasının sürətli inkişafı, iqtisadiyyatın bütün sahələrində, o cümlədən vergitutma sahəsində aparılan islahatlar istər digər ölkələrin, istərsə də nüfuzlu beynəlxalq təşkilatların diqqətini və marağını cəlb etməkdədir.

Bunun nümunəsi kimi, Dünya Bankı və Beynəlxalq Maliyyə Korporasiyasının layihəsi olan "Doing Business" (Biznesin aparılması) hesabatını qeyd etmək olar. Belə ki, hər il "Doing Business" hesabatının əhatə etdiyi 10 sahə üzrə ən böyük nailiyyətlər əldə etmiş ölkələr müəyyən edilir və "Celebrating Reform" adlı hesabatlarda əks etdirilir.

Azərbaycan Respublikasında 01 yanvar 2008-ci il tarixdən tətbiq edilən sahibkarlıq subyektlərinin "bir pəncərə" prinsipi ilə qeydiyyatı müəssisələrin qeydiyyatı sahəsində dünyada ən uğurlu islahatlardan biri hesab edilmiş və "Celebrating Reform 2008" hesabatına daxil edilmişdir.

Beynəlxalq Maliyyə Korporasiyası Vergilər Nazirliyinə müraciət edərək, "bir pəncərə" prinsipinin inkişaf edən digər ölkələr üçün nümunə ola biləcəyini bildirmiş və onun fəaliyyəti ilə yaxından tanış olmaq məqsədilə Tacikistan Respublikasının nümayəndə heyətinin qəbul edilməsini xahiş etmişlər.

Bunun nəticəsi olaraq, Tacikistan Respublikasının müxtəlif dövlət orqanlarını, ABŞ İnkişaf Agentliyini və Beynəlxalq Maliyyə Korporasiyasını təmsil edən nümayəndə heyəti Vergilər Nazirliyində səfərdə olmuşdur.

Avropa İttifaqı ilə Azərbaycan arasında Fəaliyyət Planının 2007-ci il üzrə icrasına dair Avropa İttifaqının hazırladığı "Tərəqqi" hesabatında da vergi sisteminin inkişafında ciddi irəliləyişlərin olması göstərilmişdir.

Beynəlxalq vergi sistemində Azərbaycanın imici daim artmaqdadır, beynəlxalq təşkilatlar tərəfindən hazırlanan hesabatlarda vergi sisteminin inkişafına dair aparılan islahatlar xüsusi qeyd olunmaqdadır.

Artıq Azərbaycan digər sahələrdə olduğu kimi, vergilər sahəsində də "islahatçı ölkə" kimi tanınmaqdadır və növbəti ildə bu sahədə işlər daha geniş formatda davam etdiriləcəkdir.

### Kadr siyasəti və kadr hazırlığı sahəsində

Azərbaycan Respublikası Prezidentinin 2004-cü il 29 dekabr tarixli Fərmanı ilə təsdiq edilmiş "Dövlət vergi orqanlarında işə qəbul olunmaq üçün namizədlərlə müsabiqənin keçirilməsi haqqında Əsasnamə"yə uyğun olaraq, 2008-ci ildə iki dəfə müsabiqə elan olunmuş və keçirilmişdir. Müsahibə mərhələsində 152 namizəd müvəffəqiyyət qazanmış və onlardan 143-ü işlə təmin olunmuşdur. Digər namizədlər kadr ehtiyatlarına daxil edilmişdir. Son illər vergi orqanlarında işə qəbulla əlaqədar müraciətlərin artması bu sahəyə gənclərin və mütəxəssislərin marağının yüksəlməsini göstərir.

Eyni zamanda, 2008-ci il ərzində dövlət vergi orqanlarına işə qəbul qaydaları ötən illərə nisbətən daha da təkmilləşdirilmişdir. Dövlət orqanları arasında ilk dəfə olaraq vergi orqanlarına işə qəbulla əlaqədar sənəd qəbulu elektron formada aparılmışdır. Belə ki, sənəd qəbulu qaydaları və formaları yenidən müvafiq əmrlə təsdiq olunmuşdur.

⇨ ardı 5-ci səh.

11 mart 2009-cu il № 10 (454)

# 2008-ci il Vergilər Nazirliyi üçün uğurlu olub

## *Azərbaycan Respublikasının Vergilər Nazirliyi tərəfindən 2008-ci ildə görülmüş işlər haqqında HESABAT*

⇨ əvvəli 4-cü səh.

2008-ci ildə vergi orqanı əməkdaşlarına verilən xidməti vəsiqələrin yenilənməsi məqsədilə AVİS Kadr altsistemi daxilində "Xidməti vəsiqələr" proqram təminatı hazırlanmış, xüsusi geyim formalarının dəyişməsi və aparılmış struktur, kadr yerdəyişmələri ilə əlaqədar olaraq 1779 əməkdaşa yeni vəsiqələr verilmişdir.

treninq keçirilmişdir.

Bununla bərabər müqavilə əsasında Azərbaycan Dövlət İqtisad Universitetindən, Azərbaycan Beynəlxalq Universitetindən və Maliyyə-İqtisad Kollecindən daxil olmuş müraciətlər nəzərə alınmaqla, ötən il ərzində 407 tələbənin müxtəlif vergi orqanlarında istehsalat təcrübəsi keçmələri təşkil olunmuşdur.




Eyni zamanda, ötən il ərzində Vergilər Nazirliyinin Qiymətləndirmə Şurasının rəyinə əsasən 124 əməkdaş barəsində həvəsləndirmə tədbiri görülmüşdür. O cümlədən 31 əməkdaşa təşəkkür elan edilmiş, 49 əməkdaşa vaxtından əvvəl növbəti xüsusi rütbə verilmiş, 13 əməkdaşa fərdi qaydada pul mükafatı verilmiş, 1 əməkdaşın intizam tənbehi vaxtından əvvəl ləğv edilmiş, 30 əməkdaş Fəxri fərmanla təltif edilmişdir.

Dövlət vergi orqanlarının vəzifəli şəxslərinin peşə hazırlığı, yenidən hazırlanması və ixtisaslarının artırılması, habelə vergi siyasətinə dair elmi tədqiqatların aparılması məqsədilə 2008-ci ildə Vergilər Nazirliyinin Tədris Mərkəzi tərəfindən məqsədyönlü işlər görülmüşdür.

2008-ci il ərzində vergi orqanlarının müxtəlif təlim qrupuna aid edilən əməkdaşları üçün 18 ixtisasartırma kursu, vergi orqanlarına işə yeni qəbul edilən əməkdaşlar üçün təlim müddəti 3 ay olan 3 ilkin hazırlıq kursu təşkil edilmiş və bu kurslarda 356 nəfər iştirak etmişdir.

2008-ci ildə bələdiyyələrin vergi xidməti əməkdaşları üçün "Bələdiyyələrdə vergilərin hesablanması və vergi işinin təşkili" mövzusunda 3 günlük

İl ərzində "Vergi işçisinin etik davranış məsələləri", "Korrupsiyaya qarşı mübarizə, maraqlar toqquşması və məlumat azadlığı məsələləri" mövzularında təlimçilərin treninqi təşkil edilmişdir.

İl ərzində nazirlik üzrə treninq günlərinin sayı 7394 adam-gün olmaqla, bir orta statistik vergi əməkdaşına 3,7 treninq günü düşmüşdür.

Bununla yanaşı, Tədris Mərkəzinin əməkdaşlarının iştirakı ilə "Vergilərin hesablanmasına dair praktikum. Bakı, 2008" və "İqtisadi tərəqqi və vergi siyasəti. Bakı, 2008" nəşrlər hazırlanaraq çap olunmuşdur.

### Digər sahələrdə

2008-ci il ərzində "KİV və ictimaiyyətlə əlaqələr sahəsində Tədbirlər Planı"na və digər tədbirlər çərçivəsində respublikanın mərkəzi telekanallarında vergilərə aid ümumilikdə 219 material efirə verilmiş, Vergilər Nazirliyinin fəaliyyəti, o cümlədən operativ vergi nəzarəti, vergi borcu olan vergi ödəyicilərinin əmlaklarının siyahıya alınması və həmin əmlakların açıq hərraclarda satışı, vergi cinayətləri ilə mübarizə tədbirləri, vergi daxilolmaları, həyata keçirilən müxtəlif tədbirlər, imzalanma mərasimləri və digər mövzularda 43 press-reliz hazırlanmış və KİV-ə yayılmışdır.

Azərbaycan Dövlət İqtisad Universitetində 14 ali məktəbin tələbələri arasında vergilər mövzusunda olimpiada keçirilmiş və qaliblər mükafatlandırılmışdır.

2008-ci ildə "Vergilər" qəzetinin və "Azərbaycanın Vergi xəbərləri" jurnalının dövriliyi təmin edilmiş, jurnalın 11 sayı, qəzetin 48 sayı və müxtəlif tarixlərdə 5 xüsusi buraxılışı çıxmışdır. Respublikanın televiziya kanallarında Vergilər Nazirliyinin rəhbərliyinin, ayrı-ayrı struktur bölmələrin rəhbərlərinin və vergi xidməti əməkdaşlarının 16 çıxışı təşkil edilmişdir.

Operativ vergi nəzarəti tədbirlərinin səmərəliliyinin yüksəldilməsi məqsədilə Bakı və müxtəlif regionlarda 22 reyddə KİV nümayəndələrinin iştirakı təmin edilmiş və həmin tədbirlər mərkəzi və regional KİV-də geniş işıqlandırılmışdır.

Vergi borcu olan vergi ödəyicilərinin əmlaklarının siyahıya alınması prosesinin 2 dəfə, həmin əmlakların açıq hərraclarda satışı prosesində 2 dəfə KİV nümayəndələrinin iştirakı təmin edilmiş və bu tədbirlər mərkəzi KİV-də geniş işıqlandırılmışdır.

Vergi cinayətləri ilə mübarizə tədbirlərinin səmərəliliyinin daha da artırılması məqsədilə "Cinayət işi" proqramında 12 böyük həcmli süjetin ANS telekanalında efirə verilməsi, "Nəzarət-kassa aparatı çekini alın, avtomobil qazanın" adlı stimullaşdırıcı lotereya oyununun 2008-ci ildə 11 tirajının AzTV-də canlı yayımda keçirilməsi təmin edilmişdir.

2008-ci illər ərzində kargüzarlıq sahəsində Vergilər Nazirliyinin Mərkəzi Aparatında sənəd dövriyyəsinin təşkili 4 əsas prioritet istiqamətdə: sənəd dövriyyəsinin təşkili, kargüzarlıq sahəsində icra intizamına nəzarət, yerli strukturlarla iş, koordinasiya işlərinə metodiki rəhbərlik həyata keçirilmişdir.

2008-ci ildə Vergilər Nazirliyinin Mərkəzi Aparatına 9709 sənəd daxil və 8375 sənəd xaric olmuşdur. Daxil olmuş 9709 sənəddən 6849-u icra, 2804-ü məlumat xarakterli olmuşdur.

2008-ci ildə Vergilər Nazirliyinin Aparatına daxil olan şikayətlərin sayı 1263 (99 təkrar), o cümlədən korrupsiya ilə əlaqədar hüquqpozmalarla bağlı şikayətlərin sayı 196, vergi orqanlarının vəzifəli şəxslərinin hərəkəti (hərəkətsizliyi) ilə bağlı 388, vergidən yayınma üzrə 434, qanunsuz sahibkarlıq fəaliyyəti üzrə 96, nağd hesablaşmaların aparılması qaydalarının pozulması üzrə 103, dividentlərin verilməməsi üzrə 11, sair məsələlərlə bağlı şikayətlərin sayı 35 olmuşdur.

Vətəndaşların qəbulu sahəsində 2008-ci ildə Vergilər Nazirliyinin Aparatı tərəfindən 660 vətəndaş qəbul edilmişdir. Qəbul zamanı vətəndaşların müraciətlərinin mahiyyəti diqqətlə öyrənilərək onlara izahatlar verilmiş, nazirliyin rəhbərliyi və digər vəzifəli şəxsləri tərəfindən onların qəbulu təmin edilmiş, digər müvafiq tədbirlər görülmüşdür.

Vergilər Nazirliyinin Aparatı tərəfindən 2008-ci ildə qəbul edilmiş 660 vətəndaşın təsnifatı aparılaraq müəyyən edilmişdir ki, onlardan 100 müraciət vergi orqanlarında işə qəbul edilmə, 45 müraciət vergi orqanlarının vəzifəli şəxslərinin hərəkətlərindən (hərəkətsizliyindən) şikayət, 515 müraciət isə maddi yardım, şəxsi və digər məsələlərlə əlaqədar olmuşdur.

2008-ci il üçün "Azərbaycan Respublikası Vergilər Nazirliyinin Mərkəzi Aparatında rəhbər işçilərin qəbul Qrafiki" hazırlanmış və vergilər naziri tərəfindən təsdiq edilmiş, təsdiq edilmiş qrafikin bir nüsxəsinin Azərbaycan Respublikası Prezidentinin İcra Aparatına göndərilməsi, qrafik barədə və eləcə də yerli vergi orqanlarının qəbul qrafikləri barədə Vergilər Nazirliyinin mətbu orqanlarında və internet saytında məlumatın verilməsi təmin edilmişdir.

Vergilər Nazirliyinin "Dövlət vergi orqanlarında protokol qaydalarına dair Metodiki Göstəriş"inə müvafiq olaraq vergilər naziri və nazir müavinləri tərəfindən yerli və xarici nümayəndə heyətləri ilə rəsmi görüşlər keçirilmişdir.

2008-ci ildə Azərbaycan Respublikası dövlət vergi orqanlarının vəzifəli şəxsləri yeni dizaynlı xüsusi geyim forması və fərqləndirmə nişanları ilə təchiz edilmişdir.

9 saylı Ərazi Vergilər İdarəsinin inzibati binasının tikinti işləri başa çatdırılmış və avadanlıqlarla təchiz edilmiş, Vergilər Nazirliyi yanında Vergi Cinayətlərinin İbtidai Araşdırılması Departamenti üçün yeni inzibati binanın tikilməsi məqsədilə sənədlər hazırlanmış və müvafiq icra hakimiyyəti orqanlarına təqdim edilmişdir.

11 mart 2009-cu il № 10 (454)

# Regionların inkişafında yeni mərhələ

***Beş il əvvəl ölkə başçısı cənab İlham Əliyev tərəfindən "Azərbaycan Respublikası regionlarının sosial-iqtisadi inkişafı Dövlət Proqramı" təsdiq edilmişdir. Ötən beş ildən bir qədər artıq dövr ərzində görülən işlər Dövlət Proqramının uğurla həyata keçirildiyindən xəbər verir. Proqramın icrasına başlanıldığı 2004-cü ildə bu qədər nailiyyətlərin əldə olunacağına şübhə edənlər də var idi. Ancaq Dövlət Proqramı vaxtında və gözlənildiyindən də böyük uğurla icra olundu. Bu gün regionlarda çoxsaylı problemlər öz həllini tapmış, şəhər və kəndlər abadlaşdırılmış, insanların rifahı 5 il əvvəlki vəziyyətdən daha yaxşı olmuşdur. Hələ 2004-cü ildə qeyri-neft sektorunun inkişafına nail olmaq əsas vəzifə kimi qarşıya qoyulmuşdu. Təbii resurslarla zəngin olan ölkələrdə qeyri-neft sektorunun inkişafı böyük əhəmiyyət kəsb edir. Çünki əks təqdirdə, iqtisadiyyatın dayanıqlığı qısamüddətli ola bilər. Buna görə də ölkə başçısı regionların inkişafı məsələsinə daim çox böyük diqqətlə yanaşmışdır.***









**Ölkə başçısı ötən beş ildə regionlara 127 dəfə səfər etmişdir**

Ötən dövr ərzində Dövlət Proqramının icrası nəticəsində bölgələrə çox böyük sərmayələr qoyulmuşdur. Həmçinin, özəl sektorun inkişafı üçün böyük həcmdə, güzəştli şərtlərlə kreditlər ayrılmış, sahibkarlığın inkişafına böyük dəstək verilmişdir. Son beş ildə Azərbaycan iqtisadiyyatı 2,6 dəfə artmış, adambaşına düşən gəlir 5500 dollara çatmışdır. Azərbaycanda sənaye istehsalı 2,5 dəfə yüksəlmiş və sənayeləşmə prosesi çox geniş vüsət almışdır. Hazırda ölkəmizin valyuta ehtiyatları 18 milyard dollardan çoxdur.

Bu gün Azərbaycanda elə bir sahə yoxdur ki, konkret proqramla təmin olunmasın. Hər bir proqramın konkret icra mexanizmləri, konkret maliyyə bazası var.

Sözügedən Dövlət Proqramı ilə yanaşı, ölkə başçısı son beş ildə Quba-Xaçmaz, Şəki-Zaqatala, Dağlıq Şirvan, Lənkəran, Aran, Gəncə-Qazax və Yuxarı Qarabağ iqtisadi rayonlarına daxil olan şəhər və rayonların sosial-iqtisadi inkişafının sürətləndirilməsinə dair əlavə 17 sərəncam imzalamışdır.

Bölgələrdə yaşayan vətəndaşların arzu və istəklərini, onların qayğılarını əhatə edən Dövlət Proqramının təsdiq edilməsi ölkəmizin inkişafında yeni mərhələnin başlanğıcını qoymuşdur.

Ötən beş ildə ölkə başçısı regionların bütün rayonlarını əhatə etməklə 127 səfər etmiş, o cümlədən 6 dəfə Naxçıvan Muxtar Respublikasında olmuş, yerlərdə görülən işlərlə, xalqımızın həyat səviyyəsi ilə maraqlanmış, tapşırıq və tövsiyələrini vermiş, ölkəmizin abadlaşması və inkişafı üçün əhəmiyyətli olan 500-dək müəssisə və obyektin təməlqoyma və açılış mərasimlərində şəxsən iştirak etmişdir.

Kənd təsərrüfatına tətbiq edilən vergi güzəştləri, dövlət subsidiyalarının artırılması öz müsbət nəticələrini vermişdir.

Bölgələrin inkişafı ilə bağlı Dövlət Proqramı qəbul edildikdən sonra regional inkişaf iqtisadi siyasətin əsas hədəfinə çevrilmiş, dövlət büdcəsindən maliyyələşdirilən proqramlarda bu istiqamətə ayrılan vəsaitin xüsusi çəkisi əhəmiyyətli dərəcədə artmışdır.

Dövlət investisiya xərclərində regionlardakı layihələrin həyata keçirilməsi üçün ayrılan vəsaitin məbləği 2004-cü illə müqayisədə 2008-ci ildə 6 dəfə artaraq 3,9 milyard manat təşkil etmişdir. Bu isə ümumi investisiyaların 83 faizini təşkil etmişdir. Ümumilikdə son beş il ərzində regionlara 6,8 milyard manat həcmində dövlət investisiyaları qoyulmuşdur. Kənd təsərrüfatı məhsulları istehsalçılarına yanacaq, mühərrik yağları, buğda, toxum və gübrəyə görə subsidiyaların verilməsi, texnika, gübrə və toxum təchizatının yaxşılaşdırılması üçün dövlət büdcəsindən vəsaitin ayrılması və vergi güzəştlərinin tətbiqi nəticəsində son beş ildə məhsul istehsalının nominal dəyəri 2,4 dəfə artmışdır. Ötən illərdə kənd təsərrüfatında vergi güzəştlərinin tətbiqi müsbət nəticələr verdiyi üçün və bu sahənin inkişafını növbəti illərdə daha da sürətləndirmək məqsədilə Milli Məclis noyabrın 25-də keçirilmiş iclasında "Kənd təsərrüfatı məhsulları istehsalçılarına müddətli vergi güzəştlərinin verilməsi haqqında" 2001-ci il 27 noyabr tarixli 222-IIQ nömrəli Azərbaycan Respublikası Qanununun qüvvədə olma müddətinin uzadılması barədə" qanun layihəsi müzakirə edilmiş və təsdiqlənmişdir. Həmçinin, dövlət başçısı bu Qanunun təsdiqlənməsi üçün müvafiq fərman imzalamışdır. Beləliklə də kənd təsərrüfatı məhsulları istehsalçıları növbəti dəfə, torpaq vergisindən başqa, bütün vergilərdən azad edilmişlər. Qanunda bildirilir ki, torpaq vergisi istisna olmaqla, digər vergilər üzrə güzəştlər 2009-cu il yanvarın 1-dən daha 5 il müddətinə uzadılacaqdır. Artıq 3-cü dəfədir ki, Azərbaycan hökuməti kənd təsərrüfatında vergi güzəştlərini tətbiq edir. Bu günə qədər kənd təsərrüfatının inkişafı üçün tətbiq edilən vergi güzəştləri də məhz bu sahənin inkişafına stimul vermək məqsədini daşıyıb.

Bu gün respublikamızda vergi güzəştləri ən geniş miqyasda iqtisadiyyatımızın kənd təsərrüfatı sektorunda tətbiq edilir. Hətta bəzi kritik məqamlarda Vergilər Nazirliyi kənd təsərrüfatı fəaliyyəti ilə məşğul olan borclu vergi ödəyicilərinə də müəyyən güzəştlər tətbiq edir. Bu isə qeyri-neft sektorunun ən önəmli sahələrindən hesab olunan kənd təsərrüfatının inkişafı üçün münbit şərait yaradır.

Onu da qeyd edək ki, ötən il noyabrın 17-də "Azərbaycan Respublikasının ərazisinə gətirilən, əlavə dəyər vergisindən azad olunan malların siyahısı haqqında" Nazirlər Kabinetinin 2005-ci il 31 yanvar tarixli 11 nömrəli qərarına əlavələr edilməsi barədə sənəd təsdiq edilib. Nazirlər Kabinetinin bu qərarı kənd təsərrüfatında heyvandarlıq sahəsinin inkişafını stimullaşdırmaq məqsədi daşıyır. Sənəddə Kənd Təsərrüfatı, Maliyyə, İqtisadi İnkişaf, Vergilər nazirliklərinin və Dövlət Gömrük Komitəsinin razılaşdırılmış təklifləri nəzərə alınaraq, Azərbaycan Respublikasının ərazisinə gətirilən, əlavə dəyər vergisindən azad olunan malların siyahısına cins iri və xırda buynuzlu heyvanlar da əlavə edilmişdir.

**Son beş ildə 27 min 500 yeni müəssisə yaradılmışdır**

Dövlət Proqramına uyğun olaraq, ötən beş ildə nəqliyyat infrastrukturunun təkmilləşdirilməsi məqsədi ilə regionlarda 1000 kilometrdən çox magistral yollar çəkilmiş və ya əsaslı təmir edilmiş, 600 kilometr respublika əhəmiyyətli və 2700 kilometr yerli əhəmiyyətli yollarda təmir işləri aparılmış, 69 yeni körpü tikilmiş, 34 körpü təmir edilmişdir.

Naxçıvan, Gəncə, Lənkəran və Zaqatala şəhərlərində müasir standartlara uyğun yeni hava limanları tikilmişdir. Lənkəranda isə yeni dəniz limanının tikintisi davam etdirilir. Elektrik enerjisi ilə təminatın yaxşılaşdırılması üçün 7-si regionlarda olmaqla, 9 müxtəlif tipli elektrik stansiyasının tikintisi başa çatdırılmışdır. Həmçinin Şirvan şəhərində, Dəvəçi, Quba və Füzuli rayonlarında stansiyaların tikintisi davam etdirilir. Naxçıvan Muxtar Respublikası uzun fasilədən sonra, Lerik və Yardımlı rayonları, Füzuli rayonunun Horadiz şəhəri ilk dəfə təbii qazla təmin edilmişdir. Ümumilikdə son beş ildə regionlarda 1600 kilometrədək yeni qaz xətləri çəkilmiş, ölkədə qazlaşdırmanın səviyyəsi 85 faizə çatdırılmışdır. Regionlarda rabitə infrastrukturunun, su və kanalizasiya sistemlərinin, istilik təchizatının yaxşılaşdırılması məqsədi ilə 632 avtomat telefon stansiyası, 610 yeni poçt binası, 75 qazanxana tikilib istifadəyə verilmiş, 72 qazanxana əsaslı təmir olunmuş, 720 kilometr yeni su, 210 kilometr kanalizasiya xətləri çəkilmiş, 23 su anbarı tikilmişdir.

⇨ ardı 7-ci səh.

11 mart 2009-cu il № 10 (454)

# Regionların inkişafında yeni mərhələ

⇨ əvvəli 6-cı səh.

Dövlət Proqramının qəbulundan sonra bütün bölgələrdə yeni müəssisələr yaradılmış, quruculuq və abadlıq işləri uğurla davam etdirilmişdir. Son beş ildə bütün regionları əhatə etməklə 27 min 500 yeni müəssisə və 766 mindən çox yeni iş yeri açılmışdır. Bu müəssisələrin 40 faizi, iş yerlərinin isə 80 faizi regionların payına düşür. Ötən beş il ərzində dövlət əsaslı vəsait qoyuluşu, Heydər Əliyev Fondunun dəstəyi və digər mənbələr hesabına, 1300-ü regionlarda olmaqla, 1600 məktəb binası inşa edilmişdir. Heydər Əliyev Fondunun təhsil, səhiyyə, mədəniyyət, idman və digər sahələrin inkişafına göstərdiyi dəstək proqramın icrasına önəmli töhfəsini vermişdir. Təkcə "Yeniləşən Azərbaycana yeni məktəb" layihəsi çərçivəsində ən müasir avadanlıqla, informasiya texnologiyaları ilə təmin olunmuş 238 məktəb inşa edilmiş və ya yenidən qurulmuşdur.

Regionlarda səhiyyə xidmətinin keyfiyyətinin yüksəldilməsi və idmanın inkişafı məqsədi ilə son beş ildə 16 yeni xəstəxana, 42 ambulatoriya-poliklinika, 42 özəl tibb müəssisəsi, 8 diaqnostika mərkəzi, 19 feldşer məntəqəsi, 18 Olimpiya idman kompleksi tikilib istifadəyə verilmişdir. Hazırda 15 Olimpiya idman kompleksinin və 9 diaqnostika mərkəzinin tikintisi davam etdirilir.

### Azərbaycan dünyada ən islahatçı ölkədir

Beş il ərzində Sahibkarlığa Kömək Milli Fondu vasitəsilə 7 min investisiya layihəsinə 324 milyon manat kredit verilmişdir. Bu layihələrin 87 faizi, kreditlərin isə 70 faizi regionların payına düşür. Dövlət Proqramının icrası ilə bağlı regionlarda həyata keçirilən layihələrin maliyyələşdirilməsinə beynəlxalq maliyyə qurumlarından 2,2 milyard dollar məbləğində kredit cəlb edilmişdir.

Yeri gəlmişkən onu da qeyd edək ki, sahibkarlıqla məşğul olmaq üçün prosedur qaydaları tamamilə sadələşdirilmişdir. Belə ki, ötən ilin əvvəlindən kommersiya qurumlarının dövlət reyestrinin Vergilər Nazirliyi tərəfindən "bir pəncərə" prinsipinə uyğun olaraq aparılması bu sahədə böyük dönüşə səbəb olmuşdur. Ötən müddət ərzində qeydiyyatın "bir pəncərə" prinsipi üzrə aparılması sahibkarlıq sektoruna marağın güclənməsinə və biznesin inkişafına təkan vermişdir. Digər tərəfdən, mütəxəssislər hesab edirlər ki, "bir pəncərə" sisteminin tətbiqi investisiya mühitini daha da yaxşılaşdırmış, sahibkarların dövlət qurumlarından asılılığını azaltmışdır. İndi sahibkarlar uzunmüddətli qeydiyyat prosedurlarından qurtulub sadə və çevik bir mexanizmlə öz qeydiyyat məsələlərini həll edə bilirlər. Bu prosedur sahibkarın cəmi bir neçə gündə qeydiyyata alınmasına və fəaliyyətə başlamasına imkan verir. Əvvəllər sahibkarlar fəaliyyətə başlamaq üçün 15 prosedur üzrə sənəd toplamalı, həmin sənədləri əldə etmək üçün Vergilər, Kənd Təsərrüfatı, Əmək və Əhalinin Sosial Müdafiəsi nazirliklərindən, Dövlət Statistika Komitəsindən, Sosial Müdafiə Fondundan və digər dövlət qurumlarından qeydiyyatdan keçməli idilər. Bu isə ən azı 150 gün vaxt aparırdı. "Bir pəncərə" sisteminin tətbiqindən sonra sahibkar cəmi 3 gün müddətində müəssisəsini qeydiyyatdan keçirir. Həyata keçirilən islahatlar, görülən işlər nüfuzlu beynəlxalq təşkilatlar tərəfindən də yüksək qiymətləndirilmiş və 2008-ci ildə Azərbaycan Dünya Bankı tərəfindən ən islahatçı ölkə elan olunmuşdur.

### Yeni Dövlət Proqramı hazırlanmışdır

"Azərbaycan Respublikası regionlarının sosial iqtisadi inkişafı Dövlət Proqramı"nın uğurlu icrası və son beş ildə bütün sahələrdə əldə olunmuş nailiyyətlər nəzərə alınaraq, 2009-2013-cü illəri əhatə edən yeni Dövlət Proqramı hazırlanmışdır. Qlobal iqtisadi böhran vəziyyətinə baxmayaraq, ölkə iqtisadiyyatının şaxələndirilməsi və dünya iqtisadiyyatına səmərəli inteqrasiyası, bölgələrin infrastruktur və kommunal xidmətlərlə təminat səviyyəsinin və xalqın rifah halının daha da yüksəldilməsi yeni proqramın əsas istiqamətləri kimi müəyyən edilmişdir.

Bu hədəflərə çatmaq üçün makroiqtisadi sabitliyin qorunması, dinamik inkişafın davam etdirilməsi, investisiya mühitinin daha da yaxşılaşdırılması, qeyri-neft sektorunun inkişafının sürətləndirilməsi, sahibkarlığa dövlət dəstəyinin gücləndirilməsi, ixrac yönümlü məhsul istehsalının artırılması başlıca vəzifə kimi hökumət qarşısında qoyulmuşdur.

**Rəşad SADIQOV**

# Mirasdan vergilər necə ödənilməlidir?



***Dünyanın bir sıra ölkələrində miras və onun vergiyə cəlb edilməsi məsələsinə çox ciddi münasibət mövcuddur. Əksər ölkələrdə vərəsəlik vergisi üzrə büdcəyə ödənilən vergilər xüsusi çəkiyə malikdir. Məsələn, Böyük Britaniyada, Hollandiyada adı çəkilən vergi növü üzrə vergi daxilolmaları ildən-ilə artır. Ümumiyyətlə, bu proses ciddi şəkildə təhlil edilməli və mirasın vergiyə cəlb edilməsi təmin edilməlidir. Ölkəmizdə oxşar vergi tətbiq edilməsə də, mirasdan verginin tutulması məsələsi müvafiq qanunlarla tənzimlənir.***

Vergi Məcəlləsində miras alanın (varisin) vergi öhdəlikləri və miras qoyanın vergi borcunun vərəsəlik payı əsasında miras alan tərəfindən hansı qaydada verginin ödənilməsi şərtləri müəyyən qədər nəzərdən keçirilib. Biz bu məsələlərə toxunmazdan əvvəl miras və varis anlayışlarının mülki-hüquqi tərəflərini qısaca şərh edək.

İlk öncə qeyd etməliyik ki, miras anlayışı fiziki şəxslərlə, yəni vətəndaşlarla bağlı anlayışdır. Miras dedikdə, miras qoyanın öldüyü məqamadək malik olduğu əmlak hüquqlarının (miras aktivi) və vəzifələrinin (miras passivi) toplusu başa düşülür. Şəxsi xarakter daşıyan və yalnız miras qoyana mənsub ola bilən əmlak hüquqları və vəzifələr, habelə qanunda və müqavilədə nəzərdə tutulan, yalnız kreditorun və borclunun sağlığında qüvvədə olan və onların ölümü ilə xitam verilən hüquq və vəzifələr mirasın tərkibinə daxil deyil.

Miras fiziki şəxsin ölümü və ya məhkəmə tərəfindən ölmüş elan edilməsi ilə açılır. Bu barədə məhkəmə qərarının qüvvəyə mindiyi gün isə mirasın açıldığı vaxt hesab olunur. Miras iki yolla - qanuni və vəsiyyət üzrə keçə bilər. Əgər nə qanun, nə də vəsiyyət üzrə vərəsə yoxdursa, yaxud həmin şəxslər mirası qəbul etməkdən imtina edirlərsə və ya bu hüquqdan məhrum ediliblərsə, onda həmin əmlak dövlətə keçir. Səhmlər və ya birgə əmlakdakı hissə, pay şəklində əmlakın vərəsələri olmadıqda, bu əmlak həmin hüquqi şəxslərə keçir. Qanun üzrə vərəsəlik o zaman qüvvədə olur ki, miras qoyan vəsiyyətnamə qoymur, yaxud vəsiyyətnamə tamamilə və ya qismən etibarsız sayılır.

VM-ə əsasən təqvim ili ərzində alınan mirasların məbləği qeyri-sahibkarlıq fəaliyyətindən əldə edilən gəlirə aiddir. Ancaq bu gəlirə işəgötürənin öz işçisinə malı, işi və ya xidməti təqdim etdiyi halda, onların bazar qiyməti ilə dəyəri aid deyil. Təqvim ili ərzində alınan mirasların dəyərinin 20 min manatadək hissəsi gəlir vergisindən azaddır. Miras vergi ödəyicisinin ailə üzvlərindən alındığı halda isə onun tam dəyəri gəlir vergisindən azad olunur. Ailə üzvlərinə ərarvad, valideynlər, övladlar və övladlığa götürülmüş şəxslər, vərəsələr, doğma və ögey bacı-qardaşlar, bacı və qardaşın övladları, bacının əri və qardaşın arvadı, xalalar, bibilər, əmilər, dayılar, onların arasındakı ev təsərrüfatı birliyi nəticəsində biri o biri ilə valideyn və övlad kimi bağlı olduqda, qəyyumlar və qəyyumluğa götürülənlər aiddir.

Miras əmlakının vergi öhdəliklərinin yerinə yetirilməsinə yönəldilməsinə gəldikdə isə, bu barədə VM-in 77-ci və 81-ci maddələrində söhbət açılır. Belə ki, VM-in 77-ci maddəsində deyilir ki, "vəfat etmiş və ya ölmüş hesab edilən şəxsin əmlak vergiləri üzrə borclar vərəsəlik əmlakının dəyəri hədlərində ödənilir." Məcəllənin 81-ci maddəsinə əsasən isə vəfat etmiş fiziki şəxsin vergi öhdəliklərinin onun varisləri tərəfindən miras qalan əmlakının dəyəri hüdudlarında və mirasın alındığı tarixdəki payın mütənasib şəkildə ödənilməsi nəzərdə tutulur. Şəxs vəfat etdikdə, onun mirasının keçməsi üçün varisi olmadıqda isə həmin şəxsin vergi öhdəlikləri silinir. Çünki varis olmadıqda şəxsin vərəsəlik əmlakı dövlətin xəsinəsinə yönəldilir.

Mülki Məcəllənin 72-ci fəslində vərəsələr tərəfindən kreditorların təmin edilməsinin şərtləri və müddəti göstərilib. Belə ki, miras qoymuş şəxsin kreditorları mirasın açıldığının onlara məlum olduğu gündən 6 ay ərzində mirası qəbul etmiş vərəsələrə qarşı tələblərini, bunların müddətlərinin çatıb-çatmamasından asılı olmayaraq, irəli sürməlidirlər. Buradan belə aydın olur ki, vergi orqanı vəfat etmiş şəxsin vergi borcları üzrə tələblərini 6 ay ərzində miras almış şəxsə yönəltməlidir. Əgər vergi orqanı mirasın açılması barədə vaxtında məlumat almayıbsa, miras almış şəxsə qarşı vergi borcları üzrə tələb onun müddətinin çatdığı gündən 1 il ərzində irəli sürülə bilər. Bu qaydalara əməl edilmədikdə, yəni tələb müddəti keçdikdə kreditorlar tələb hüquqlarını itirə bilərlər. Miras qoymuş şəxsin borclularının bütün tələbləri vərəsələr tərəfindən, əgər başqa hal nəzərdə tutulmayıbsa, birdəfəlik ödənişlər yolu ilə ödənilməlidir.

Sonda onu qeyd edək ki, bu sahə üzrə çox ciddi vergitutma bazası mövcud olduğundan istənilən halda vergi orqanları vergilərin tam şəkildə büdcəyə ödənilməsini təmin etməlidirlər. Həmçinin, digər sahələrdə olduğu kimi, miras yolu ilə də sərvət sahibi olan insaların qanunvericiliyə müvafiq olaraq vergilərinin hesablanıb büdcəyə ödənilməsi təmin edilməli və bu sahəyə nəzarət mexanizmləri təkmilləşdirilməlidir.

**Rüfət MƏRDANOV**

# Şəffaflığın artırılması və korrupsiyaya qarşı mübarizə üzrə Milli Strategiyanın Vergilər Nazirliyi tərəfindən icrası uğurla həyata keçirilir

***Məlum olduğu kimi, Azərbaycan Respublikası Prezidentinin 2007-ci il tarixli 2292 nömrəli Sərəncamı ilə "Şəffaflığın artırılması və korrupsiyaya qarşı mübarizə üzrə Milli Strategiya və onun həyata keçirilməsi ilə bağlı 2007-2011-ci illər üçün Fəaliyyət Planı" təsdiq edilmişdir. Milli Strategiyanın əsas məqsədi korrupsiyaya qarşı mübarizə sahəsində müvafiq tədbirlərin davam etdirilməsi, normativ hüquqi bazanın və institusional mexanizmlərin təkmilləşdirilməsi, dövlət və yerli özünüidarə orqanlarının fəaliyyətində şəffaflığın artırılması və bu sahədə dövlət siyasətinin həyata keçirilməsidir.***

**əvvəli ötən saylarımızda**

Fəaliyyət Planının 48-ci bəndində vergi nəzarəti və yoxlamalarının səmərəliliyinin artırılması tapşırığı verilmişdir. Bu bəndin icrası ilə əlaqədar vergi ödəyicilərinin seçilməsində subyektivliyi aradan qaldırmaq məqsədilə vergi ödəyicilərinin seçilməsi proseslərinin avtomatlaşdırılması sahəsində proqram təminatı hazırlanmış və hal-hazırda real vaxt rejimində istifadəsi həyata kecirilir.

Bununla bərabər, "Vergi qanunvericiliyi və inzibatçılığının təkmilləşdirilməsi üzrə 2009-2012-ci illər üçün Strateji Plan"a beynəlxalq təcrübədə "elektron audit" sisteminin tətbiqi məsələlərinin araşdırılması və bu sahədə istifadə olunan proqram təminatlarının (ACL, IDEA və SESAM) və ya yeni proqram təminatının Azərbaycanda tətbiqi imkanlarının qiymətləndirilməsi tədbiri daxil edilmişdir.

AVİS-də audit seçiminin optimallaşdırılması modellərinin informasiya bazasının təkmilləşdirilməsinə dair təkliflər hazırlanmışdır. Audit seçiminin optimallaşdırılması modellərinin informasiya bazasının genişləndirilməsi və təkmilləşdirilməsi məqsədi ilə işlənmiş "Standart kənarlaşma (t-test) model"i və "Göstəricinin maksimum və minimum qiymətlərinə əsaslanan model"i nazirliyin müvafiq strukturlarına göndərilərək, onların rəyi alınmışdır. "Standart kənarlaşma (t-test) model"i sadələşdirilmiş vergi ödəyicilərinin potensialının müəyyənləşdirilməsi və vergidən yayınma hallarının aşkarlanması məqsədi ilə proqramlaşdırılmış və ilkin testdən keçirilmişdir.

Eyni zamanda, Vergilər Nazirliyinin Mərkəzi Aparatının funksional idarələri tərəfindən baxılmış şikayət və ərizələrlə əlaqədar (korrupsiya ilə bağlı hüquqpozmalar istisna olmaqla) qəbul edilmiş qərarlarla və ya verilmiş yazılı cavablarla razılaşmayan vergi ödəyicilərinin şikayətlərinə Vergilər Nazirliyinin Vergi Apellyasiya Şurası tərəfindən baxılır. Vergilər Nazirliyinin funksional idarələri tərəfindən baxılmış şikayət ərizələri və ərizələr ilə əlaqədar qəbul edilmiş qərarlarla və ya cavablarla razılaşmayan vergi ödəyicilərinin şikayətləri təkrar olaraq icraçı funksional idarəyə deyil, Vergilər Nazirliyinin Vergi Apellyasiya Şurasında baxılmağa hazırlanması üçün Vergilər Nazirliyinin aidiyyəti strukturuna verilir.

Vergilər nazirinin müvafiq əmri ilə "Vergi ödəyiciləri üçün daha mükəmməl apellyasiya sistemi haqqında Qaydalar" təsdiq edilmişdir. Qeyd olunan Qaydalara əsasən, Vergilər Nazirliyinin funksional idarələri tərəfindən baxılmış şikayət və ərizələrlə əlaqədar qəbul edilmiş qərarlarla və ya verilmiş cavablarla razılaşmayan vergi ödəyicilərinin şikayətlərinə baxılması üzrə kollegial orqan olan Vergilər Nazirliyinin Vergi Apellyasiya Şurası yaradılmışdır. 2008-ci ildə həmin Şura tərəfindən 7 şikayət ərizəsi araşdırılmış və müvafiq tədbirlər görülmüşdür. Bundan başqa, qanunvericiliyə uyğun olaraq məcburi auditin obyekti olan təsərrüfat subyektlərinin auditdən yayınma hallarının qarşısının alınması üçün "Axtarış & hesabat" informasiya sistemində "Yoxlama ilə əhatə edilməmiş vergi ödəyiciləri barədə məlumat" bölümü işlənib hazırlanmış və hal-hazırda istifadə edilir.

Qeyd edək ki, vergi auditi məqsədilə risk modellərinə əsaslanan seçilmə sisteminin icraçı şirkət tərəfindən hazırlanması yekunlaşmış və hal-hazırda istifadəsi real vaxt rejimində yeni bəyannamə məlumatları əsasında davam edir. Vergi auditi məqsədilə risk modellərinə əsaslanan seçilmə sistemi bir-birindən müstəqil olan 6 modeldən ("Vergiləndirmə periodu içərisində müxtəlif bəyannamələrin müqayisəli modeli", "Sapma modeli", "Statistik analiz modeli", "Maliyyə nisbətləri modeli", "Xarici məlumatlar modeli", "Kameral model") ibarətdir.

2007-ci ilin 1-ci rübündən başlayaraq, Vergilər Nazirliyi tərəfindən hazırlanmış proqram təminatlarında müvafiq uyğunlaşdırmalar aparılmışdır ki, bunun nəticəsində də respublikamızda vergi orqanları ilə müvafiq elektron məlumat mübadiləsinin aparılması haqqında müqavilə imzalamış vergi ödəyicilərinə vergi orqanları tərəfindən istifadəçi kodu, xüsusi şifrə-parollar verildikdən sonra onlar bu şifrə və parollardan istifadə etməklə öz bəyannamələrini vergi orqanlarına internet vasitəsilə, yəni vergi orqanına gəlmədən təqdim edirlər.

Hal-hazırda respublikada "e-bəyannamə" sisteminin tam həcmdə tətbiqinə başlanılmış və artıq bu xidmətdən istifadə edən vergi ödəyicilərinin sayı 110000-ə çatdırılmışdır. Vergi ödəyiciləri tərəfindən İnternet Vergi İdarəsi vasitəsilə 600000 çox bəyannamə elektron formada təqdim edilmişdir. Bundan başqa, e-xidmətlə əlaqədar müqavilələr bağlanmış, vergi ödəyicilərinin vergi orqanına gəlmədən müxtəlif sənədlərin göndərilməsi ilə əlaqədar rahatlığının təmin edilməsi məqsədilə dövr ərzində bu vergi ödəyiciləri tərəfindən "Bankda hesab açılması məqsədilə şəhadətnamə-dublikatın alınması üçün ərizə"nin, "Vergi ödəyicisinin əlavə dəyər vergisi məqsədləri üçün qeydiyyata alınması haqqında ərizə"nin elektron formada təqdim edilməsinə imkanlar yaradılmışdır.

Qeyd edək ki, ƏDV ödəyiciləri tərəfindən öz depozit hesabları vasitəsi ilə aparılmış əməliyyatlara baxış imkanlarının yaradılması təmin olunmuşdur.

Bundan başqa, bəyannamələrin təqdim edilmə və kameral və səyyar vergi yoxlamalarının həyata keçirilməsi sahəsində beynəlxalq təcrübə öyrənilmiş və Rusiya Federasiyasının təcrübəsi bəyənilmişdir. Burada vergi orqanlarına internet vasitəsi ilə bəyannamələrin təqdim edilməsi imkanlarının olmasına baxmayaraq, kağız formatda da təqdim edilməyə üstünlük verilir və bu zaman həmin kağız formatlı bəyannamələrdə qeyd olunmuş məlumatlar müvafiq avadanlığın köməyi ilə formanın üzərində əks olunmuş xüsusi ştrix-kod vasitəsilə birbaşa, yəni işçi qüvvəsindən istifadə edilmədən birbaşa bazaya daxil edilir.

Həmin sistemin və avadanlıqların tətbiqi zamanı vergi ödəyiciləri öz kompüterində Bəyannamələrin Tərtibat Proqramı vasitəsilə bəyannamələrini dolduraraq çap etdiyi zaman bəyannamənin göstəriciləri formanın üzərində əks olunan ştrix-kodla kodlaşdırılacaq və vergi orqanının koordinasiya-kargüzarlıq strukturlarında həmin bəyannamə və hesabatların ilkin qeydiyyatı vaxtı bəyannamə məlumatlarının birbaşa bazaya işlənməsi təmin ediləcəkdir. Artıq 2008-ci ilin dekabr ayının 1-dən etibarən vergi ödəyiciləri tərəfindən vergi orqanlarına ştrix-kodla kodlaşdırılan bəyannamələrin təqdim edildiyi zaman onların qəbul olunaraq məlumat bazasına işlənilməsi təmin olunmuşdur.

Qeyd edilən Fəaliyyət Planının digər bəndində vergi ödəyicilərinin zəruri məlumatlarla təmin edilməsinin asanlaşdırılması nəzərdə tutulmuşdur. Bununla əlaqədar, vergilərin könüllü ödənilməsi sisteminin inkişaf etdirilməsi, regionlarda sahibkarlığın inkişafı və əlverişli biznes mühitinin formalaşdırılması məqsədilə Vergilər Nazirliyi tərəfindən respublikanın şəhərlərində vergi ödəyiciləri üçün 15 kompüter terminalı yaradılmış və 2008-ci ilin aprel ayından etibarən vergi ödəyicilərinin istifadəsinə verilmişdir.

Ötən il ərzində qeyd olunan kompüter terminallarında 18457 vergi ödəyicisi qəbul edilərək, onlara 44969 sayda müxtəlif növ vergi xidməti, o cümlədən 11963 vergi ödəyicisinə bəyannamələrin elektron formada göndərilməsi, 9978 vergi ödəyicisinə bəyannamələrin düzgün tərtib edilməsi ilə əlaqədar köməklik göstərilmiş, 7541 vergi ödəyicisinə vergi qanunvericiliyinə aid məlumat və izahatlar verilmiş və 15487 digər xidmətlər göstərilmişdir.

Vergilər nazirinin müvafiq əmri ilə "Vergi orqanlarında vergi ödəyicilərinin uçotunun aparılmasına dair Metodiki Göstəriş"ə dəyişiklik edilmiş və e-bəyannamələrin tətbiqi ilə əlaqədar vergi ödəyicilərinə ilkin qeydiyyat zamanı elektron şifrə və parolun alınması imkanının yaradılması nəzərdə tutulmuşdur. Bununla bağlı proqram təminatında müvafiq dəyişikliklər aparılmış və hazırda vergi ödəyicilərinin ilkin qeydiyyatı zamanı elektron şifrə və parolun verilməsi təmin olunur. Bu, vergi bəyannamələrinin internet vasitəsilə elektron formatda təqdim olunmasının tətbiqi imkanlarını daha da genişləndirmişdir. Vergi ödəyicilərinə göstərilən e-xidmətlərin sayı artmışdır. Vergi ödəyicilərinə bankda hesab açmaq üçün şəhadətnamə-dublikat almaq və ƏDV qeydiyyatına dayanmaq məqsədilə vergi orqanına elektron ərizə təqdim etmək imkanı yaradılmışdır.

**Toğrul ƏLİYEV**

11 mart 2009-cu il № 10 (454)

# Təbrik edirik!

Bu günlərdə Vergilər Nazirliyi Kommersiya hüquqi şəxslərin dövlət qeydiyyatının təşkili və iqtisadi təhlil Baş İdarəsinin İqtisadi təhlil və proqnozlaşdırma şöbəsinin rəisi, kiçik vergi xidməti müşaviri Yadulla Həsənlinin 50 yaşı tamam olmuşdur.

Yadulla Həmdulla oğlu Həsənli 7 mart 1959-cu ildə Saatlı rayonunda anadan olmuşdur. O, 1976-cı ildə Səməd Vurğun adına 1 saylı Saatlı şəhər orta məktəbini bitirib. Həmin il riyaziyyat fənni üzrə keçirilən məktəblərarası Ümumrespublika olimpiadasının iştirakçısı və mükafatçısı olmuşdur.

1976-cı ildə Azərbaycan Dövlət Universitetinin (hazırkı Bakı Dövlət Universiteti) tətbiqi riyaziyyat fakültəsinə daxil olan Yadulla Həsənli 1981-ci ildə həmin fakültəni bitirmiş və təyinatla Azərbaycan Milli Elmlər Akademiyasının Kibernetika İnstitutunda mühəndis-proqramçı vəzifəsinə göndərilmişdir. Y.Həsənli 1983-cü ildə həmin institutun aspiranturasına daxil olmuş və 1989-cu ildə "Kənd təsərrüfatı müəssisələrinin fəaliyyətinin modelləşdirilməsi" mövzusunda namizədlik dissertasiyasını müdafiə edərək iqtisad elmləri namizədi alimlik dərəcəsi almışdır. 2000-ci ildə Azərbaycan Respublikası Prezidenti yanında Ali Attestasiya Komissiyasının qərarı ilə Yadulla Həsənliyə baş elmi işçi, 2005-ci ildə isə dosent (professor-assistant) elmi adı verilmişdir. Yadulla müəllim 2007-ci ildə "Azərbaycanın sosial-iqtisadi inkişafının modelləşdirilməsi məsələləri" mövzusunda doktorluq dissertasiyasını müdafiyə edərək, iqtisad elmləri doktoru alimlik dərəcəsi almışdır. Yadulla Həsənli 100-ə qədər elmi əsərin, 2 monoqrafiya, 1 dərs vəsaitinin müəllifidir. O, eyni zamanda, 2 elmlər namizədi yetişdirmişdir. Yadulla müəllimin 10 elmi əsəri xarici ölkələrdə dərc olunmuş, 20-yə yaxın beynəlxalq elmi konfransda iştirak etmişdir.

O, 1981-ci ildən Kibernetika İnstitutunda mühəndis, kiçik elmi işçi, elmi işçi, böyük elmi işçi, baş elmi işçi, sektor müdiri vəzifələrində çalışmışdır. Hal-hazırda isə laboratoriya müdiri vəzifəsində işləyir. Eyni zamanda, 1994-cü ildən Bakı Dövlət Universitetində tətbiqi riyaziyyat və iqtisadi kibernetika ixtisasında iqtisadiyyatın modelləşdirilməsi istiqamətində bir sıra fənlərdən mühazirə və seminarlar aparır. Y.Həsənli 1998-1999-cu illərdə Azərbaycan Respublikası Prezidenti yanında Milli Dövlətçilik Akademiyasında 0,5 ştat dosent, 1999-2005-ci illərdə isə Ali Diplomatiya Kollecində (indiki Avrasiya Universiteti) kafedra müdiri vəzifələrində işləmişdir. Yadulla müəllim 2000-ci ildə



Dünya Bankının, 2002-ci ildə isə Asiya İnkişaf Bankının eksperti olmuşdur. 2003-cü ildə "VEKTOR" beynəlxalq Elm Mərkəzinin "Azərbaycanın gənc alimləri" beynəlxalq layihəsinin qalibi olmuş və "XXI-ci əsrin gənc alimi" beynəlxalq diplomu ilə təltif edilmişdir. Yadulla Həsənli 2002-2005-ci illərdə Milli Bankda Monetar siyasət Departamentinin elmi məsləhətçisi olmuşdur. 2005-ci ildən Vergilər Nazirliyinin Kommersiya hüquqi şəxslərin dövlət qeydiyyatının təşkili və iqtisadi təhlil Baş İdarəsinin İqtisadi təhlil və proqnozlaşdırma şöbəsinin rəisi vəzifəsində işləyir.

Yadulla müəllim işlədiyi bütün dövrlərdə özünü bacarıqlı, işgüzar mütəxəssis kimi göstərmişdir. Bu da onun işlədyi bütün kollektivlərdə dərin hörmət qazanmasına səbəb olmuşdur. Ailəlidir, bir övladı var.

Kommersiya hüquqi şəxslərin dövlət qeydiyyatının təşkili və iqtisadi təhlil Baş İdarəsinin rəisinin 1-ci müavini, baş vergi xidməti müşaviri İbrahim Sadıqov bizimlə söhbətində Yadullla müəllimin bacarıqlı, işgüzar bir mütəxəssis və mehriban insan olduğunu vurğuladı, onu ad günü münasibətilə təbrik etdi: "Yadulla müəllim işlədiyi dövr ərzində öz vəzifəsinin öhdəsindən layiqincə gəlib. Bunun nəticəsində də o, kollektivin və rəhbərliyin dərin hörmətini qazanıb. Mən bütün kollektivimiz adından Yadulla müəllimi ad günü münasibətilə təbrik edir, ona cansağlığı və işlərində uğurlar arzu edirəm".

Kommesiya hüquqi şəxslərin dövlət qeydiyyatının təşkili və iqtisadi təhlil Baş İdarəsinin Vergidən yayınma hallarının və risklərin təhlili şöbəsinin böyük dövlət vergi müfəttişi Tağı Vəliyev Yadulla Həsənlinin işlədiyi müddət ərzində bütün kollektivin dərin hörmət və etimadını qazandığını qeyd etdi.

Biz də "Vergilər" qəzetinin kollektivi adından Yadulla müəllimi təbrik edir, ona uzun ömür, cansağlığı və işlərində uğurlar arzu edirik.

Martın 5-də 14 saylı Ərazi Vergilər İdarəsinin kollektivi üçün əlamətdar bir gün olmuşdur. Həmin gün kollektivin sevimlisi olan Təbriz Axundovun 50 yaşı tamam olurdu. Baş vergi xidməti müşaviri Axundov Təbriz Mehdi oğlu 14 saylı ƏVİ-də Kommersiya hüquqi şəxslərin dövlət qeydiyyatı və vergi ödəyicilərinin uçotu şöbəsinin rəisi vəzifəsində çalışır.

T.Axundov 1959-cu ildə Qazax rayonunun Yuxarı Salahlı kəndində anadan olmuşdur. 1976-cı ildə Yuxarı Salahlı kənd orta məktəbini bitirən T.Axundov həmin ilin sentyabrından 1977-ci ilin avqustuna qədər Bakı şəhər 3 nömrəli təmir-tikinti idarəsində fəhlə işləmişdir. O, 1977-ci ildə D.Bünyadzadə adına Azərbaycan Xalq Təsərrüfatı İnstitutunun maliyyə-kredit fakültəsinə daxil olmuş, 1981-ci ildə həmin ali məktəbi bitirmişdir.

Bir neçə ay Kirovabad (indiki Gəncə) şəhər Maliyyə şöbəsində iqtisadçı vəzifəsində işləyən T.Axundov həmin ilin noyabrında həqiqi hərbi xidmətə çağrılmışdır. 1983-cü ildə hərbi xidməti başa vurduqdan sonra 1990-cı ilin iyun ayınadək Gəncə şəhəri Nizami rayon Maliyyə şöbəsində iqtisadçı, baş iqtisadçı, şöbə rəisinin müavini, şöbə rəisi vəzifələrində işləmişdir. 1990-cı ilin iyul ayından 1995-ci ilin mart ayına kimi Gəncə şəhəri Nizami rayon Dövlət Vergi Müfəttişliyində rəis müavini, 1995-ci ilin mart ayından 1999-cu ilin fevral ayına kimi Gəncə şəhərb üzrə Dövlət Vergi Müfəttişliyinin rəis müavini, 1999-cu ildən 2000-ci ilin mart ayına kimi nəzarət şöbəsinin rəisi vəzifələrində işləmişdir.

2000-ci ilin mart ayından 2002-ci ilin noyabr ayınadək Gəncə şəhər Vergilər İdarəsində müxtəlif məsul vəzifələrdə çalışmışdır.

T.Axundov 15 noyabr 2003-cü il tarixdən 12 saylı ƏVİ-nin Bəyannamələr şöbəsində baş dövlət vergi müfəttişi vəzifəsində işləyib. 28 dekabr 2007-ci il tarixdən isə 14 saylı ƏVİ-nin Kommersiya hüquqi şəxslərin dövlət qeydiyyatı və vergi ödəyicilərinin uçotu şöbəsinin rəisi vəzifəsində çalışır.

Ailəlidir, 3 övladı var.

İş yoldaşları T.Axundov haqqında fəxrlə söhbət açırlar. Onların sözlərinə görə, Təbriz müəllim vergi işçisinə xas olan bütün müsbət xüsusiyyətlərə malik təcrübəli mütəxəssis, kollektivdə səmimi və mehriban insandır. Bütün bu keyfiyyətlərinə görə 14 saylı ƏVİ-nin kollektivi T.Axundova böyük hörmət və ehtiram göstərirlər.

Fevralın 14-də Təbriz müəllimin 50 yaşı tamam oldu. Yubilyar üçün həmin gündə ən gözəl hədiyyə iş yoldaşlarının onu səmimiyyətlə təbrik etməsi olub.

İdarənin rəis müavini, kiçik vergi xidməti müşaviri Rizvan Sultanov yubilyar haqqında danışarkən bildirdi ki, T.Axundov öz peşəsini sevən, iş yol-



daşlarına hörmət və səmimiyyətlə yanaşan bir insandır: "O, həm vergi işçisi, həm də bir yoldaş kimi öz vəzifəsinə və hərəkətlərinə məsuliyyətlə yanaşır. Bu isə onun həm rəhbərlik yanında, həm də iş yoldaşları arasında rəğbət qazanmasına gətirib çıxarmışdır. Mən bütün kollektivimiz adından Təbriz müəllimi 50 yaşının tamam olması münasibətilə səmimi qəlbdən təbrik edirəm".

14 saylı ƏVİ-nin Vergi ödəyicilərinə xidmət şöbəsinin rəisi, kiçik vergi xidməti müşaviri Muraz Rzayev də T.Axundov haqqında ürək sözlərini bildirdi: "Təbriz müəllim uzun müddətdir vergi sistemində çalışır və bu sahədə onun təcrübəsi, bacarığı böyük önəm kəsb edir. Bir insan kimi isə Təbriz müəllim öz mehribanlığı və səmimiyyəti ilə iş yoldaşları və dostları arasında böyük hörmət qazanıb. Kollektivimiz Təbriz müəllimi çox sevir. Onu bu yubiley münasibətilə təbrik edir, gələcək fəaliyyətində uğurlar arzulayırıq".

*Azərbaycan Respublikası vergilər nazirinin*
*9 fevral 2009-cu il tarixli 0917040100089600 №-li*
*Əmri ilə təsdiq edilmişdir*

# "Gəlir vergisinin bəyannaməsi"nin tərtib edilməsi Q a y d a s ı

**(əvvəli ötən saylarda)**

- Bəyannamənin 1218 "Həyatın yığım sığortası üzrə sığorta olunanın ödədiyi və ya onun xeyrinə ödənilən sığorta haqları arasındakı fərq məbləği" sətrinin müvafiq A1 xanalarında Vergi Məcəlləsinin 99.3.9-cu maddəsinə uyğun olaraq vergi ödəyicisinə həyatın yığım sığortası üzrə sığorta olunanın ödədiyi və ya onun xeyrinə ödənilən sığorta haqları arasındakı fərq məbləği (hər xanada bir rəqəmlə) göstərilir.

***Misal:*** 2008-ci ildə fərdi sahibkara həyatın yığım sığortası üzrə sığorta olunanın ödədiyi və ya onun xeyrinə ödənilən sığorta haqları arasında 120,0 min manat fərq məbləği gəlir kimi əldə edilmişdir. Bu halda 1218 sətrinin A1 xanalarında 120 ,0 min manat məbləğ aşağıdakı kimi yazılır.

| | | | |
|---|---|---|---|
| 1218 | Həyatın yığım sığortası üzrə sığorta olunanın ödədiyi və ya onun xeyrinə ödənilən sığorta haqları arasındakı fərq məbləği | A1 | 1 2 0 0 0 0 0 0 |

- Bəyannamənin 1219 Yeni uçot metodunun tətbiq edilməsindən yaranmış gəlirlər" sətrinin müvafiq A1 xanalarında yeni uçot metodunun tətbiq edilməsindən yaranmış gəlirlərin (Vergi Məcəlləsinin 130.5-ci maddəsinə əsasən uçot metodu dəyişdirilərkən verginin məbləğinə təsir göstərən mühasibat əməliyyatlarına düzəlişlər uçot metodunun dəyişdirildiyi ildə aparılmalıdır ki, bu əməliyyatlardan heç biri nəzərdən qaçırılmasın və ya iki dəfə hesaba alınmasın) məbləği (hər xanada bir rəqəmlə) göstərilir.

***Misal:*** 2007-ci ildə fərdi sahibkar vergilərin uçotunu kassa metodu ilə aparılmış, 2008-ci ildə isə uçot metodunu dəyişdirərək hesablamalar metoduna keçmişdir. Bu zaman, fərdi sahibkar 01.01.2008-ci il tarixə yüklənmiş mallara görə 3000,0 min manat debitor borcları üzrə və çəkilən xərclərə görə 2000,0 min manat kreditor borcları üzrə qalıqlarını 2008-ci ilin yekununa görə öz maliyyə nəticələrinə aid etməlidir. Bu halda 1219 sətrinin A1 xanalarında 1000,0 min manat (3000,0 - 2000,0) məbləğ aşağıdakı kimi yazılır.

| | | | |
|---|---|---|---|
| 1219 | Yeni uçot metodunun tətbiq edilməsindən yaranmış gəlirlər | A1 | 1 0 0 0 0 0 0 0 0 |

- Bəyannamənin 1220 "Yuxarıdakı bəndlərdə nəzərdə tutulmayan digər gəlirlər (o cümlədən gəlir vergisindən azad edilən gəlirlər)" sətrinin müvafiq A1 xanalarında 1200 - 1219 -cu sətirlərdə nəzərdə tutulmayan digər gəlirlərin, o cümlədən Vergi Məcəlləsinin 102.1.-ci maddədə göstərilən vergidən azad edilən gəlirlərin məbləği (hər xanada bir rəqəmlə) göstərilir.

***Misal:*** 2008-ci ildə fərdi sahibkar Vergi Məcəlləsinin 102.1-ci maddəsinə əsasən 170,0 min manat gəliri olmuşdur. Bu halda 1220 sətrinin A1 xanalarında 170,0 min manat məbləğ aşağıdakı kimi yazılır.

| | | | |
|---|---|---|---|
| 1220 | Yuxarıdakı bəndlərdə nəzərdə tutulmayan digər gəlirlər (o cümlədən mənfəət vergisindən azad edilən gəlirlər) | A1 | 1 7 0 0 0 0 0 0 |

- Bəyannamənin 1221 "Ü M U M İ G Ə L İ R L Ə R" (sət.1200 + sət.1201 + sət.1202 + sət.1203 + sət.1204 + sət.1205 + sət.1206 + sət.1207 + sət.1208 + sət.1209 + sət.1210 + sət.1211 + sət.1212 + sət.1213 + sət.1214 + sət.1215 + sət.1216 + sət.1217 + sət.1218 + sət.1219 + sət.1220) sətrinin müvafiq A1 xanalarında yuxarıda mötərizədə göstərilən sətirlərin cəmi məbləği (hər xanada bir rəqəmlə) göstərilir.

- Bəyannamənin 1222 "Ümumi gəlirdən çıxılmalar sətrinin "A1" xanalarında (hər xanada bir rəqəmlə) 1222.1 "Rezident tərəfindən ödənilən dividend", 1222.2 "Faizlər", 1222.3 "Royalti", 1222.4 "Təqdim olunmuş (amortizasiya olunmayan) aktivlərin qalıq dəyəri" xanalarında, 1222.5 "Xarici valyutalarının manata nisbətən məzənnəsinin dəyişməsindən ilin sonuna yaranan mənfi fərq", 1222.6 "Daşınan və daşınmaz əmlakın icarəyə verilməsindən ödəmə mənbəyində tutulmuş gəlir", 1222.6 "Vergidən azad edilən gəlirlər" sətrlərinin xanalarında VM 102-cı maddəsinə müvafiq olaraq göstərilmiş məbləğlərin cəmisi ( 1222.1 + 1222.2 + 1222.3 + 1222.4 + 1222.5 + 1222.6 + 1222.7 ) göstərilir. 1222.1 sətrinin A1 xanalarında rezident vergi ödəyicisi tərəfindən ödənilən və ödəmə mənbəyində VM 122-ci maddəsinə əsasən vergiyə cəlb edilmiş dividendlərin ümumi (ödəmə mənbəyində tutulmuş vergi nəzərə almadan) məbləğləri göstərilməlidir.

***Misal:*** 2008-ci ildə rezident vergi ödəyicisi tərəfindən 1200,0 min manat dividend hesablanmış və ödəmə mənbəyində 10% vergi tutaraq fərdi sahibkara 1080,0 min manat ödəniş aparılmışdır. Eyni zamanda, fərdi sahibkara eyni qaydada 50,0 min manat faiz və 250,0 min manat royalti hesablanmış, müvafiq olaraq 10 və 14 faiz ödəmə mənbəyində vergi tutularaq 45,0 və 215,0 min manat məbləğ ödənilmişdir. 2008-ci ildə anbarda saxlanılan istsmara verilməmiş, amortizasiya olunmayan və qalıq dəyəri 800,0 min manat olan avadanlıq təqdim edilmişdir. Bundan başqa həmin dövrdə xarici valyuta ilə aparılan mənfi məzənnə fərqi 80,0 min manat təşkil etmiş və bilavasitə kənd təsərrüfatı məhsullarının istehsalından alınan gəliri 100,0 min manat olmuşdur. Bu halda bəyannamənin müvafiq xanaları aşağıdakı kimi doldurulur:

| | | | |
|---|---|---|---|
| 1222 | Ümumi gəlirdən çıxılmalar | A1 | 2 4 8 0 0 0 0 0 0 |
| 1222.1 | Rezident tərəfindən ödənilən dividend | A1 | 1 2 0 0 0 0 0 0 0 |
| 1222.2 | Faizlər | A1 | 5 0 0 0 0 0 0 |
| 1222.3 | Royalti | A1 | 2 5 0 0 0 0 0 0 |
| 1222.4 | Təqdim olunmuş (amortizasiya olunmayan) aktivlərin qalıq dəyəri | A1 | 8 0 0 0 0 0 0 0 |
| 1222.5 | Xarici valyutaların manata nisbətən məzənnənin dəyişməsindən yaranan mənfi fərq | A1 | 8 0 0 0 0 0 0 |
| 1222.6 | Daşınan və daşınmaz əmlakın icarəyə verilməsindən ödəmə mənbəyində tutulmuş gəlir | A1 | 0 0 0 |
| 1222.7 | Vergidən azad olunan gəlirlər | A1 | 1 0 0 0 0 0 0 0 |

- Bəyannamənin 1223 "Çıxılmalardan sonra ÜMUMİ GƏL?R" sətrin "A1" xanalarında (hər xanada bir rəqəmlə) 1221 "Ümumi gəlir" səitrin A1 xanalarında göstərilən məbləğlərdən 1222 "Ümumi gəlirdən çıxılmalar" sətrin A1 xanalarında göstərilən məbləğləri çıxılmasından əmələ gələn fərq yazılmalıdır.

**Hissə 2. Hesabat dövründə gəlirlərin əldə edilməsi ilə bağlı XƏRCLƏR**

- Bəyannamənin 2-ci bölməsinin 2-ci "Hesabat dövründə gəlirlərin əldə edilməsi ilə bağlı XƏRCLƏR" hissəsində 1224 "Malların təqdim edilməsi, iş görülməsi və xidmət göstərilməsi üzrə xərclər sətrinin A4 xanalarında (hər xanada bir rəqəmlə) 1224.1 --- 1224.15 sətrlərinin A4 xanalarında göstərilmiş məbləğlərin cəmi ( 1224.1 + 1224.2 + 1224.3 + 1224.4 + 1224.5 + 1224.6 + 1224.7 + 1224.8 + 1224.9 + 1224.10 + 1224.3 + 1224.12 + 1224.13 + 1224.14 + 1224.15 ) yazılır.

- 1224.1 "Əmək haqqı və ona bərabər tutulan ödənişlər" sətrinin A1 xanalarında (hər xanada bir rəqəmlə) 1224.1.1 "əcnəbi işçilər üzrə" və 1224.1.2 "yerli işçilər üzrə" sətrlərinin xanalarında göstərilmiş məbləğlərin cəmi ( 1224.1.1 + 1224.2.2 ) göstərilir. Bu sətrlər üzrə hesabat dövrü ərzində gəlirin əldə edilməsi ilə bağlı işəgötürən fərdi sahibkar tərəfindən muzdla işləyən fiziki şəxslərə (daimi və müvəqqəti) aparılan əmək haqqı və ona bərabər tutulan ödənişlərin məbləğləri göstərilir.

***Misal:*** Vergi ödəyicisində 2008-ci ildə əsas iş yeri olan 1 nəfər əcnəbi, 15 nəfər yerli işçi çalışmışdır. Həmin dövrdə bu işçilərə müvafiq olaraq 1500,0 min manat və 17500,0 min manat əmək haqqı hesablanmış və ödənilmişdir. Eyni zamanda həmin dövrdə müvəqqəti əmək müqaviləsi əsasında müəssisədə 2 nəfər əcnəbi vətəndaş çalışmış və onlara 3500,0 min manat əmək haqqı ödənilmişdir. Bu halda 1224.1 "Əmək haqqı və ona bərabər tutulan ödənişlər" sətrinin A4 xanalarında, 1224.1.1 "əcnəbi işçilər üzrə" və "yerli işçilər üzrə" sətrlərinin A4 xanalarında məbləğlər aşağıdakı kimi yazılır:

| | | | |
|---|---|---|---|
| 1224.1 | Əmək haqqı və ona bərabər tutulan ödənişlər | A4 | 2 2 5 0 0 0 0 0 0 0 |
| 1224.1.1 | əcnəbi işçilər üzrə | A4 | 5 0 0 0 0 0 0 0 0 |
| 1224.1.2 | yerli işçilər üzrə | A4 | 1 7 5 0 0 0 0 0 0 0 |

- Bəyannamənin 1224.2 "Sosial sığorta haqqları" sətrinin A4 xanalarında (hər xanada bir rəqəmlə) işəgötürən tərəfindən hesablanmış icbari sosial sığorta ayırmaları göstərilir.

***Misal:*** Vergi ödəyicisində 2008-ci ildə əsas iş yeri olan 15 nəfər yerli işçi çalışmışdır. Vergi ödəyicisi tərəfindən həmin işçilərə il ərzində 2100,0 min manat sosial sığorta ayırmaları hesablanmışdır (ödənilmişdir). Bu halda 1224.3 "Sosial sığorta haqqları" sətrinin xanalarında məbləğlər aşağıdakı kimi yazılır:

| | | | |
|---|---|---|---|
| 1224.2 | Sosial sığorta haqqları | A4 | 2 1 0 0 0 0 0 0 0 |

- Bəyannamənin 1224.4 "Xammal və materialları" sətrinin A4 xanalarında (hər xanada bir rəqəmlə) VM-nin 139-cu maddəsində nəzərdə tutulmuş qaydada uçota alınmış əmtəə-material ehtiyatlarının (xammal və material) gəlirin əldə edilməsi ilə bağlı məsrəflərə silinmiş dəyəri əks etdirilməlidir.

**(ardı var)**

11 mart 2009-cu il № 10 (454)

# Kommersiya qurumlarının dövlət reyestri məlumatları

| | |
|---|---|
| 1 | Kommersiya qurumunun adı: "QRO-010" MƏHDUD MƏSULİYYƏTLİ CƏMİYYƏTİ |
| | Qeydiyyat nömrəsi (VÖEN): 4400345971 |
| | Təşkilati-hüquqi forması: Məhdud məsuliyyətli cəmiyyət |
| | Hüquqi ünvanı: AZ3600, QƏBƏLƏ RAYONU, QƏBƏLƏ.Ş, İ.QUTQAŞİNLI ev. DALAN 3, EV 1 |
| | Nizamnamə kapitalı: 10 manat |
| | Maliyyə ili: 01 Yanvar - 31 Dekabr |
| | Qanuni təmsilçi: ŞEYDAYEV ELXAN HİDAYƏT OĞLU |
| | Təsisçilər (kommanditçilər): RƏSULOV RƏFAİL ZEYNAL OĞLU |
| | Dövlət qeydiyyatına alındığı tarix: 19 Yanvar 2009. |
| 2 | Kommersiya qurumunun adı: "ŞAMRA" MƏHDUD MƏSULİYYƏTLİ CƏMİYYƏTİ |
| | Qeydiyyat nömrəsi (VÖEN): 1301865491 |
| | Təşkilati-hüquqi forması: Məhdud məsuliyyətli cəmiyyət |
| | Hüquqi ünvanı: AZ1006, BAKI ŞƏHƏRİ YASAMAL RAYONU, MİKAYIL MÜŞFİQ ev.8B m.2 |
| | Nizamnamə kapitalı: 100 manat |
| | Maliyyə ili: 01 Yanvar - 31 Dekabr |
| | Qanuni təmsilçi: HÜMBƏTƏLİYEV ANAR MÜBARİZ OĞLU |
| | Təsisçilər (kommanditçilər): ƏSGƏROV RASİM EDSON OĞLU, HÜMBƏTƏLİYEV ANAR MÜBARİZ OĞLU, DAVUTOĞLU ŞEMSİ RASİM (Türkiyə Respublikası) |
| | Dövlət qeydiyyatına alındığı tarix: 19 Yanvar 2009. |
| 3 | Kommersiya qurumunun adı: "İMPERATOR-ZH" MƏHDUD MƏSULİYYƏTLİ CƏMİYYƏTİ |
| | Qeydiyyat nömrəsi (VÖEN): 7400174991 |
| | Təşkilati-hüquqi forması: Məhdud məsuliyyətli cəmiyyət |
| | Hüquqi ünvanı: AZ6100, UÇAR RAYONU, QARADAĞLI KƏNDİ |
| | Nizamnamə kapitalı: 10 manat |
| | Maliyyə ili: 01 Yanvar - 31 Dekabr |
| | Qanuni təmsilçi: NURMƏMMƏDOVA SVETLANA İDRİSOVNA |
| | Təsisçilər (kommanditçilər): NURMƏMMƏDOVA SVETLANA İDRİSOVNA |
| | Dövlət qeydiyyatına alındığı tarix: 19 Yanvar 2009. |
| 4 | Kommersiya qurumunun adı: "RXE-09" MƏHDUD MƏSULİYYƏTLİ CƏMİYYƏTİ |
| | Qeydiyyat nömrəsi (VÖEN): 4400346071 |
| | Təşkilati-hüquqi forması: Məhdud məsuliyyətli cəmiyyət |
| | Hüquqi ünvanı: AZ3600, QƏBƏLƏ RAYONU, QƏBƏLƏ.Ş, İ.QUTQAŞİNLI ev.DALAN 3, EV 1 |
| | Nizamnamə kapitalı: 10 manat |
| | Maliyyə ili: 01 Yanvar - 31 Dekabr |
| | Qanuni təmsilçi: ŞEYDAYEV ELXAN HİDAYƏT OĞLU |
| | Təsisçilər (kommanditçilər): RƏSULOV RƏFAİL ZEYNAL OĞLU |
| | Dövlət qeydiyyatına alındığı tarix: 19 Yanvar 2009. |
| 5 | Kommersiya qurumunun adı: "PS KONSALTİNQ" MƏHDUD MƏSULİYYƏTLİ CƏMİYYƏTİ |
| | Qeydiyyat nömrəsi (VÖEN): 1301865361 |
| | Təşkilati-hüquqi forması: Məhdud məsuliyyətli cəmiyyət |
| | Hüquqi ünvanı: AZ1141, BAKI ŞƏHƏRİ YASAMAL RAYONU, ŞƏFAYƏT MEHDİYEV ev.95 |
| | Nizamnamə kapitalı: 30 manat |
| | Maliyyə ili: 01 Yanvar - 31 Dekabr |
| | Qanuni təmsilçi: AĞAKİŞİBƏYLİ CEYHUN CALAL OĞLU |
| | Təsisçilər (kommanditçilər): AĞAKİŞİYEV RƏŞİD CƏLAL OĞLU, HACINSKİ FƏRHAD İSMAYILBƏY OĞLU |
| | Dövlət qeydiyyatına alındığı tarix: 19 Yanvar 2009. |
| 6 | Kommersiya qurumunun adı: "N.MÜHAFİZƏ XİDMƏTİ" MƏHDUD MƏSULİYYƏTLİ CƏMİYYƏTİ |
| | Qeydiyyat nömrəsi (VÖEN): 2100331491 |
| | Təşkilati-hüquqi forması: Məhdud məsuliyyətli cəmiyyət |
| | Hüquqi ünvanı: AZ1800, ŞİRVAN ŞƏHƏRİ, M.HÜSEYNZADƏ ev.44 |
| | Nizamnamə kapitalı: 50 manat |
| | Maliyyə ili: 01 Yanvar - 31 Dekabr |
| | Qanuni təmsilçi: AĞALAROV MİRƏLƏM AFƏT OĞLU |
| | Təsisçilər (kommanditçilər): AĞALAROV MİRƏLƏM AFƏT OĞLU |
| | Dövlət qeydiyyatına alındığı tarix: 19 Yanvar 2009. |
| 7 | Kommersiya qurumunun adı: "STATUS-05" MƏHDUD MƏSULİYYƏTLİ CƏMİYYƏTİ |
| | Qeydiyyat nömrəsi (VÖEN): 7400175091 |
| | Təşkilati-hüquqi forması: Məhdud məsuliyyətli cəmiyyət |
| | Hüquqi ünvanı: AZ6100, UÇAR RAYONU, QARADAĞLI KƏNDİ |
| | Nizamnamə kapitalı: 10 manat |
| | Maliyyə ili: 01 Yanvar - 31 Dekabr |
| | Qanuni təmsilçi: NURMƏMMƏDOVA SVETLANA İDRİSOVNA |
| | Təsisçilər (kommanditçilər): NURMƏMMƏDOVA SVETLANA İDRİSOVNA |
| | Dövlət qeydiyyatına alındığı tarix: 19 Yanvar 2009. |
| 8 | Kommersiya qurumunun adı: "OLİMPİK" MƏHDUD MƏSULİYYƏTLİ CƏMİYYƏTİ |
| | Qeydiyyat nömrəsi (VÖEN): 1401495001 |
| | Təşkilati-hüquqi forması: Məhdud məsuliyyətli cəmiyyət |
| | Hüquqi ünvanı: AZ1014, BAKI ŞƏHƏRİ NƏSİMİ RAYONU, SÜLEYMAN RÜSTƏM ev.9 m.2 |
| | Nizamnamə kapitalı: 1000 manat |
| | Maliyyə ili: 01 Yanvar - 31 Dekabr |
| | Qanuni təmsilçi: KAMİLOV ƏŞRƏF KAMİL OĞLU |
| | Təsisçilər (kommanditçilər): KAMİLOV ƏŞRƏF KAMİL OĞLU |
| | Dövlət qeydiyyatına alındığı tarix: 19 Yanvar 2009. |
| 9 | Kommersiya qurumunun adı: "BMS KONSTRAKŞN" MƏHDUD MƏSULİYYƏTLİ CƏMİYYƏTİ |
| | Qeydiyyat nömrəsi (VÖEN): 2001396031 |
| | Təşkilati-hüquqi forması: Məhdud məsuliyyətli cəmiyyət |
| | Hüquqi ünvanı: AZ1149, BAKI ŞƏHƏRİ XƏTAİ RAYONU, VUNQTAU ev.11A m.23 |
| | Nizamnamə kapitalı: 200 manat |
| | Maliyyə ili: 01 Yanvar - 31 Dekabr |
| | Qanuni təmsilçi: EROL CEM .(Türkiyə Respublikası) |
| | Təsisçilər (kommanditçilər): HÜSEYNOV CƏLİL NAZİM OĞLU, EROL CEM .(Türkiyə Respublikası) |
| | Dövlət qeydiyyatına alındığı tarix: 19 Yanvar 2009. |
| 10 | Kommersiya qurumunun adı: "FƏQAN-T" MƏHDUD MƏSULİYYƏTLİ CƏMİYYƏTİ |
| | Qeydiyyat nömrəsi (VÖEN): 2001395931 |
| | Təşkilati-hüquqi forması: Məhdud məsuliyyətli cəmiyyət |
| | Hüquqi ünvanı: AZ1129, BAKI ŞƏHƏRİ XƏTAİ RAYONU, GƏNCƏ PR. ev.109 |
| | Nizamnamə kapitalı: 120 manat |
| | Maliyyə ili: 01 Yanvar - 31 Dekabr |
| | Qanuni təmsilçi: MURTUZAYEV ƏFQAN TELMAN OĞLU |
| | Təsisçilər (kommanditçilər): MURTUZAYEVA MARAL ƏLƏKBƏR QIZI, MURTUZAYEV TELMAN BƏYİŞ OĞLU, MURTUZAYEV ƏFQAN TELMAN OĞLU |
| | Dövlət qeydiyyatına alındığı tarix: 19 Yanvar 2009. |
| 11 | Kommersiya qurumunun adı: "İŞIQ-M" MƏHDUD MƏSULİYYƏTLİ CƏMİYYƏTİ |
| | Qeydiyyat nömrəsi (VÖEN): 1401495391 |
| | Təşkilati-hüquqi forması: Məhdud məsuliyyətli cəmiyyət |
| | Hüquqi ünvanı: AZ1010, BAKI ŞƏHƏRİ NƏSİMİ RAYONU, SALATIN ƏSGƏROVA ev.213 m.25 |
| | Nizamnamə kapitalı: 20 manat |
| | Maliyyə ili: 01 Yanvar - 31 Dekabr |
| | Qanuni təmsilçi: ABBASOV MƏMMƏD ƏSGƏR OĞLU |
| | Təsisçilər (kommanditçilər): ABBASOV MƏMMƏD ƏSGƏR OĞLU |
| | Dövlət qeydiyyatına alındığı tarix: 19 Yanvar 2009. |
| 12 | Kommersiya qurumunun adı: "RAMZES II" MƏHDUD MƏSULİYYƏTLİ CƏMİYYƏTİ |
| | Qeydiyyat nömrəsi (VÖEN): 2600681811 |
| | Təşkilati-hüquqi forması: Məhdud məsuliyyətli cəmiyyət |
| | Hüquqi ünvanı: AZ4221, LƏNKƏRAN RAYONU, DARQUBA KƏNDİ |
| | Nizamnamə kapitalı: 20 manat |
| | Maliyyə ili: 01 Yanvar - 31 Dekabr |
| | Qanuni təmsilçi: MƏMMƏDOV HABİL ƏLİSA OĞLU |
| | Təsisçilər (kommanditçilər): MƏMMƏDOV HABİL ƏLİSA OĞLU |
| | Dövlət qeydiyyatına alındığı tarix: 19 Yanvar 2009. |
| 13 | Kommersiya qurumunun adı: "TEXNO-İSKRA" MƏHDUD MƏSULİYYƏTLİ CƏMİYYƏTİ |
| | Qeydiyyat nömrəsi (VÖEN): 1001559701 |
| | Təşkilati-hüquqi forması: Məhdud məsuliyyətli cəmiyyət |
| | Hüquqi ünvanı: AZ1130, BAKI ŞƏHƏRİ BİNƏQƏDİ RAYONU, ƏCƏMİ NAXÇIVANİ ev.34B m.22 |
| | Nizamnamə kapitalı: 4 manat |
| | Maliyyə ili: 01 Yanvar - 31 Dekabr |
| | Qanuni təmsilçi: CƏFƏROV FƏRHAD DADAŞ OĞLU |
| | Təsisçilər (kommanditçilər): QULİYEV ZAUR VALEH OĞLU, CƏFƏROV FƏRHAD DADAŞ OĞLU |
| | Dövlət qeydiyyatına alındığı tarix: 21 Yanvar 2009. |
| 14 | Kommersiya qurumunun adı: "B.EST SOLUTİONS" MƏHDUD MƏSULİYYƏTLİ CƏMİYYƏTİ |
| | Qeydiyyat nömrəsi (VÖEN): 1401496181 |
| | Təşkilati-hüquqi forması: Məhdud məsuliyyətli cəmiyyət |
| | Hüquqi ünvanı: AZ1014, BAKI ŞƏHƏRİ NƏSİMİ RAYONU, RƏŞİD BEHBUDOV ev.48 m.25 |
| | Nizamnamə kapitalı: 100 manat |
| | Maliyyə ili: 01 Yanvar - 31 Dekabr |
| | Qanuni təmsilçi: İBRAHİMOV EMİN RƏŞİD OĞLU |
| | Təsisçilər (kommanditçilər): "E-SOLUTİONS" MƏHDUD MƏSULİYYƏTLİ CƏMİYYƏTİ, "OOO AZVEST" ŞİRKƏTİ (Estoniya Respublikası) |
| | Dövlət qeydiyyatına alındığı tarix: 21 Yanvar 2009. |
| 15 | Kommersiya qurumunun adı: "QİDA SÜNBÜL" MƏHDUD MƏSULİYYƏTLİ CƏMİYYƏTİ |
| | Qeydiyyat nömrəsi (VÖEN): 4000413841 |
| | Təşkilati-hüquqi forması: Məhdud məsuliyyətli cəmiyyət |
| | Hüquqi ünvanı: AZ0900, BƏRDƏ RAYONU, BƏRDƏ ŞƏHƏRİ, CAVANŞİR ev.553 |
| | Nizamnamə kapitalı: 10 manat |
| | Maliyyə ili: 01 Yanvar - 31 Dekabr |
| | Qanuni təmsilçi: ABBASOV ELGİZ HÜSEYN OĞLU |
| | Təsisçilər (kommanditçilər): ABBASOV ELGİZ HÜSEYN OĞLU |
| | Dövlət qeydiyyatına alındığı tarix: 21 Yanvar 2009. |
| 16 | Kommersiya qurumunun adı: "HÜRİYYƏ BİKƏ" MƏHDUD MƏSULİYYƏTLİ CƏMİYYƏTİ |
| | Qeydiyyat nömrəsi (VÖEN): 1501365001 |
| | Təşkilati-hüquqi forması: Məhdud məsuliyyətli cəmiyyət |
| | Hüquqi ünvanı: AZ1008, BAKI ŞƏHƏRİ NƏRİMANOV RAYONU, QƏDİRBƏYOVA ev.63A m.103 |
| | Nizamnamə kapitalı: 10 manat |
| | Maliyyə ili: 01 Yanvar - 31 Dekabr |
| | Qanuni təmsilçi: POPOVA LYUDMİLA MATVEYEVNA |
| | Təsisçilər (kommanditçilər): POPOVA LYUDMİLA MATVEYEVNA |
| | Dövlət qeydiyyatına alındığı tarix: 21 Yanvar 2009. |
| 17 | Kommersiya qurumunun adı: "MELORASİYA TƏMİR TİKİNTİ" MƏHDUD MƏSULİYYƏTLİ CƏMİYYƏTİ |
| | Qeydiyyat nömrəsi (VÖEN): 2100331771 |
| | Təşkilati-hüquqi forması: Məhdud məsuliyyətli cəmiyyət |
| | Hüquqi ünvanı: AZ1800, ŞİRVAN ŞƏHƏRİ, XƏQANİ ev.17 m.49 |
| | Nizamnamə kapitalı: 50 manat |
| | Maliyyə ili: 01 Yanvar - 31 Dekabr |
| | Qanuni təmsilçi: ƏHMƏDOV TAHİR ABUSƏT OĞLU |
| | Təsisçilər (kommanditçilər): ƏHMƏDOV TAHİR ABUSƏT OĞLU |
| | Dövlət qeydiyyatına alındığı tarix: 21 Yanvar 2009. |
| 18 | Kommersiya qurumunun adı: "NİYAZ-C" MƏHDUD MƏSULİYYƏTLİ CƏMİYYƏTİ |
| | Qeydiyyat nömrəsi (VÖEN): 2200351421 |
| | Təşkilati-hüquqi forması: Məhdud məsuliyyətli cəmiyyət |
| | Hüquqi ünvanı: AZ6611, YEVLAX RAYONU, ARAN ŞTQ |
| | Nizamnamə kapitalı: 20 manat |
| | Maliyyə ili: 01 Yanvar - 31 Dekabr |
| | Qanuni təmsilçi: ATAKİŞİYEV NİYAZ FƏRRUX OĞLU |
| | Təsisçilər (kommanditçilər): ATAKİŞİYEV NİYAZ FƏRRUX OĞLU |
| | Dövlət qeydiyyatına alındığı tarix: 21 Yanvar 2009. |
| 19 | Kommersiya qurumunun adı: "MEQAS" MƏHDUD MƏSULİYYƏTLİ CƏMİYYƏTİ |
| | Qeydiyyat nömrəsi (VÖEN): 1401496591 |
| | Təşkilati-hüquqi forması: Məhdud məsuliyyətli cəmiyyət |
| | Hüquqi ünvanı: AZ1014, BAKI ŞƏHƏRİ NƏSİMİ RAYONU, SÜLEYMAN RÜSTƏM ev.9 m.2 |
| | Nizamnamə kapitalı: 1000 manat |
| | Maliyyə ili: 01 Yanvar - 31 Dekabr |
| | Qanuni təmsilçi: KAMİLOV ƏŞRƏF KAMİL OĞLU |
| | Təsisçilər (kommanditçilər): KAMİLOV ƏŞRƏF KAMİL OĞLU |
| | Dövlət qeydiyyatına alındığı tarix: 21 Yanvar 2009. |
| 20 | Kommersiya qurumunun adı: "AZTEX KONSTRUKTOR LTD" MƏHDUD MƏSULİYYƏTLİ CƏMİYYƏTİ |
| | Qeydiyyat nömrəsi (VÖEN): 1301867071 |
| | Təşkilati-hüquqi forması: Məhdud məsuliyyətli cəmiyyət |
| | Hüquqi ünvanı: AZ1009, BAKI ŞƏHƏRİ YASAMAL RAYONU, MİRZƏ İBRAHİMOV ev.53 |
| | Nizamnamə kapitalı: 10 manat |
| | Maliyyə ili: 01 Yanvar - 31 Dekabr |
| | Qanuni təmsilçi: NƏCƏFOV BƏHRUZ AĞARƏHİM OĞLU |
| | Təsisçilər (kommanditçilər): NƏCƏFOV BƏHRUZ AĞARƏHİM OĞLU |
| | Dövlət qeydiyyatına alındığı tarix: 21 Yanvar 2009. |

⇨ ardı 12-ci səh.

